# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Noyabr 2014
09 (1063)

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ




## General Əlağa Şıxlinskinin 150 illik yubileyinin keçirilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2015-ci ilin aprel ayında Azərbaycanın görkəmli hərbi xadimi, tanınmış hərbçi alim, general-leytenant Əlağa İsmayıl ağa oğlu Şıxlinskinin anadan olmasının 150 illiyi tamam olur.

XX əsrin əvvəllərindən etibarən irimiqyaslı hərbi əməliyyatların iştirakçısı kimi general Əlağa Şıxlinski döyüş meydanlarındakı şücaətləri və artilleriya nəzəriyyəsinə gətirdiyi yenilikləri ilə hərb tarixinə parlaq səhifələr yazmışdır. O, Azərbaycan Xalq Cümhuriyyətinin mühüm dövlət təsisatları yaradılarkən milli qoşun hissələrinin təşkilində, müstəqil ordu quruculuğunda müstəsna fəaliyyət göstərmiş, sonrakı dövrlərdə də hərbi andına sadiq qalaraq ölkənin silahlı qüvvələrinin formalaşdırılmasına töhfələr vermişdir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və gənc nəslin vətənpərvərlik ruhunda tərbiyəsində əhəmiyyətini nəzərə alaraq, Azərbaycan xalqı qarşısında böyük xidmətləri olan general-leytenant Əlağa Şıxlinskinin 150 illik yubileyinin dövlət səviyyəsində keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Respublikasının Müdafiə Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi ilə birlikdə görkəmli hərbi xadim, general-leytenant Əlağa İsmayıl ağa oğlu Şıxlinskinin 150 illik yubileyinə dair tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 20 noyabr 2014-cü il*

## Türk dünyasının böyük hərbi-siyasi xadimi

### *ADPU-da Mustafa Kamal Atatürkü anım mərasimi keçirilib*

**Bu günlər Türkiyədə və eləcə də Azərbaycanda Türk dünyasının böyük oğlu, görkəmli hərbi-siyasi xadim, Türkiyə Respublikasının qurucusu və ilk prezidenti Mustafa Kamal Atatürkün vəfat etməsinin 76-cı ildönümü ilə əlaqədar müxtəlif tədbirlər keçirilir. Bu tədbirlərdə böyük vətənpərvər Mustafa Kamal Atatürkün Türk xalqı qarşısında göstərdiyi müstəsna tarixi xidmətlər sadalanır, eyni zamanda onun bütün Türk dünyasının dünya şöhrətli siyasət və dövlət xadimi olması fikri xüsusi vurğulanır. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) noyabr ayının 11-də Mustafa Kamal Atatürkü anım mərasimi də bu mövzuda keçirilən dəyərli tədbirlərdən biri olmuşdur.**

Rəsmi və bədii hissədən ibarət olan anım mərasimində ilk olaraq Mustafa Kamal Atatürkün və onun silahdaşlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilmiş, həmçinin Azərbaycanın və Türkiyənin Dövlət Himnləri səsləndirilmişdir. Tədbirdə çıxış edən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov tədbirin keçirilməsinə görə türkiyəli tələbələrin İdarə Heyətinə və eləcə də bu tədbirdə fəal iştirak edən azərbaycanlı tələbə-gənclərə öz təşəkkürünü bildirmiş, hər iki xalqı




soykökü, dili, dini, mədəniyyəti və məqsədləri eyni olan doğma bir xalq kimi səciyyələndirmişdir.

Rektor Y.Məmmədov Türk dünyasının ulu öndəri Mustafa Kamal Atatürkün həyat yoluna nəzər salaraq bildirmişdir ki, görkəmli siyasət və dövlət xadimi Mustafa Kamal Atatürk 1881 -ci il may ayının 19-da Osmanlı İmperiyasına məxsus Saloniki şəhərində anadan olmuşdur. Əvvəlcə Osmanlı, sonra isə Türkiyə ordusunda zabit kimi uzun müddət hərbi qulluq etmişdir. Mustafa Kamal Atatürk Türkiyədə 1919-cu ildə başlayan milli-azadlıq hərəkatının öndəri olmuşdur. Onun hərbi-siyasi fəaliyyətində Çanaqqala savaşı xüsusi şərəfli bir yer tutur. Belə ki, bu gün bütün Türk dünyasının parlaq hərbi-siyasi istedadından, məharətindən böyük qürur və fəxr duyduğu Mustafa Kamal Atatürk bu döyüşdə öz üzərinə düşən hərbi vəzifələri layiqincə yerinə yetirmşdir. Mübaliğəsiz deyə bilərik ki, böyük Atatürkün öz əsgərlərinə «Mən sizə vuruşmağı əmr etmirəm, ölməyi əmr edirəm!» çağırışı Çanaqqala savaşının gedişinə və nəticəsinə böyük təsir göstərmişdir. Mustafa Kamal Atatürk elə döyüşlərin ilk günlərindən öz parlaq sərkərdəlik qabiliyyətini və hərbi istedadını üzə çıxararaq məşhurlaşmışdır. Bu fakt həm də Mustafa Kamal Atatürkün Türk xalqının milli lideri kimi ortaya çıxmasına həlledici təsir göstərmişdir.

Onu da qeyd edək ki, Mustafa Kamal Atatürk 1921-ci ildə Sakarya Meydan Müharibəsində Sakarya Meydan Müharibəsindən sonra "Qazi" adını almış və ona ali marşal rütbəsi verilmişdir. Mustafa Kamal Atatürk öz ölkəsini xarici hərbi müdaxilədən azad etmiş və Türkiyə Respublikasını qurmuşdur. Müdrik dövlət xadimi Mustafa Kamal Atatürk müasir Türkiyəni formalaşdıran və hərtərəfli inkişaf yoluna çıxaran çoxsaylı islahatlar həyata keçirmişdir. Türkiyə tarixində bu vəzifəni ondan daha uzun




müddətə daşıyan prezident olmamışdır. O, 4 dəfə Türkiyənin prezidenti seçilmişdir.

Türk dünyasının məşhur siyasət və dövlət xadimi, böyük mütəfəkkir, bütün ömrünü xalqına, millətinə, Vətəninə həsr etmiş Mustafa Kamal Atatürk 1938-ci il noyabr ayını 10-da İstanbulda Dolmabaxça sarayında vəfat etmişdir. Böyük qürur hissi ilə deyə bilərik ki, Mustafa Kamal Atatürk dünyanın həyat və fəaliyyətləri ən çox öyrənilən 100 böyük şəxsiyyətindən biridir.

Mustafa Kamal Atatürk həmişə Azərbaycana doğma münasibət bəsləmişdir. O, "Azərbaycanın sevinci bizim sevincimiz, kədəri bizim kədərimizdir. Azərbaycan bizim qardaşımızdır. Heç nəyə baxmayaraq, ona yardım etmək bizim borcumuzdur" - demişdir.

Rektor Y.Məmmədov öz çıxışında xüsusi qeyd etmişdir ki, müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ulu öndərimiz Heydər Əliyevin müvafiq sərəncamı ilə 2001-ci il mart ayının 9-da Azərbaycanda Atatürk Mərkəzi yaranmişdır. Həmin Mərkəzin əsas vəzifəsi Türk dünyasının böyük öndəri Mustafa Kamal Atatürkün irsinin və bütövlükdə Türk tarixinin və mədəniyyətinin daha dərindən öyrənilməsi və təbliğ edilməsidir. Bu Mərkəz xalqımızın görkəmli alimi, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor, millət vəkili Nizami Cəfərovun rəhbərliyi altında uğurla fəaliyyət göstərir.

Ulu öndərimiz Heydər Əliyevin "Biz bir millət, iki dövlətik" ifadəsi iki qardaş xalq arasındakı mənəvi-siyasi birliyi özündə dolğun əks etdirir. Yeri gəlmişkən, onu da qeyd edim ki, Türk dünyasının dahi öndərləri Mustafa Kamal Atatürkün və Heydər Əliyevin həyat və fəaliyyətlərində oxşar cəhətlər çoxdur. Belə ki, hər iki böyük tarixi şəxsiyyət may ayında anadan olmuşlar. Onların hər ikisi öz xalqlarını məhv olmaq təhlükəsindən xilas etmiş, sabit, dayanaqlı, güclü dövlət qurmuş, ölkələrini hərtərəfli inkişaf yoluna çıxarmışlar. Türk dünyasının bu iki böyük oğlu həmişə elm və təhsilə yüksək qiymət vermiş, gəncləri oxuyub-öyrənməyə, milli-mənəvi və ümumbəşəri dəyərlərə sadiq qalmağa səsləmişlər. Mustafa Kamal Atatürkün Türk millətinə qoyub getdiyi ən böyük ərmağan, ən böyük əsər müasir, demokratik Türkiyə Respublikasıdır. Müstəqil, müasir, demokratik Azərbaycan isə ulu öndər Heydər Əliyevin şah əsəridir.

Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin uzaqgörən və müdrik siyasəti nəticəsində bu gün ölkəmizlə Türkiyə arasında əlaqə və münasibətlər yüksək səviyyədə inkişaf edir. Bu əlaqə və münasibətlər artıq strateji xarakter almışdır. Bu yaxınlarda Azərbaycan və Türkiyə hərbi qüvvələrinin birgə keçirdikləri genişmiqyaslı hərbi təlimlər də bunu bir daha təsdiq etdi. Azərbaycanla Türkiyə həm regionda, həm də beynəlxalq təşkilatlarda yüksək səviyyədə əməkdaşlıq edir və bir-birinə hərtərəfli dəstək verir. Hazırda Türkiyə iqtisadi və siyasi cəhətdən çox inkişaf etmiş bir ölkədir. Azərbaycan da hərtərfli tərəqqi, inkişaf yolundadır. Hər iki qardaş ölkənin belə inkişafı bizdə böyük sevinc və qürur hissi doğurur.

Anım mərasimində çıxış edən Türkiyənin Azərbaycandakı Təhsil müşaviri cənab Abdulqafar Böyükfırat Mustafa Kamal Atatürkün vəfat etməsinin 76-cı ildönümü ilə əlaqədar tədbirin keçirilməsinə görə ADPU-nun rektoru, professor Y.Məmmədova öz dərin təşəkkürünü bildirmişdir. O, Azərbaycanın son illər iqtisadi cəhətdən dinamik inkişaf etməsindən, paytaxt Bakının, eləcə də respublikamızın bütün bölgələrinin gözəlləşməsindən, müasirləşməsindən qürur duyduğunu xüsusi qeyd etmişdir. Cənab Abdulqafar Böyükfırat eyni zamanda ADPU-nun rektoru, professor Y.Məmmədova rəhbərlik etddiyi ali təhsil müəssisəsində yaratdığı şəffaf təhsil mühitinə, eləcə də türkiyəli tələbə-gənclərə göstərdiyi xüsusi qayğı və diqqətə görə öz minnətdarlığını ifadə etmişdir.

Anım mərasimində Mustafa Kamal Atatürkün həyat və fəaliyyətinin müxtəlif məqamlarını əks etdirən videoçarx nümayiş etdirilmiş, türkiyəli və azərbaycanlı tələbələrin ifasında Atatürkə həsr olunmuş şeirlər səsləndirilmişdir.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**



# Tarixi zərurətdən yaranan siyasi partiya

## ADPU-da YAP-ın yaranmasının 22-ci ildönümünə həsr edilmiş konfrans keçirilib

Noyabr ayının 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) yaranmasının 22-ci ildönümünə həsr edilmiş konfrans keçirilib. Konfrans başlamazdan öncə tədbir iştirakçıları ulu öndər Heydər Əliyevin universitetdəki abidəsinin önünə gül dəstələri qoyaraq xatirəsini ehtiramla yad ediblər, sonra isə tədbir "Heydər Əliyev məktəbinin lektoriyası"nda davam etdirilib. İlk olaraq ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov konfransda çıxış edərək bildirib ki, biz bu gün YAP-ın yaranma tarixinə, keçdiyi böyük və şərəfli inkişaf yoluna və eyni zamanda onun cəmiyyətimizin bugünkü siyasi həyatındakı roluna qiymət vermək üçün ilk növbədə, ölkəmizdə ötən əsrin 80-ci illərinin sonları-90-cı illərinin əvvəllərində baş verən ictimai-siyasi hadisələrə diqqət yetirməliyik. Məlumdur ki, Azərbaycan xalqının 1988-ci ildə SSRİ-nin süqutu prosesi və Dağlıq Qarabağ münaqişəsi ilə əlaqədar başlayan milli-azadlıq hərəkatı bir çox müsibətlərlə, faciələrlə üzləşməli olurdu. Belə ki, mərkəzi hakimiyyət öz




imperiya iddialarından əl çəkməyərək, bəzi respublikalarda olduğu kimi, Azərbaycan xalqının da istiqlal mübarizəsini qanla, zorakı yollarla beşiyindəcə boğmağa çalışırdı. Eyni zamanda xalqımıza qarşı əsrin əvvəllərində olduğu kimi, yenə də əsassız ərazi iddiaları işə salınmışdı. Ermənilərin öz havadarlarının köməyi ilə Dağlıq Qarabağın Azərbaycandan alınaraq Ermənistana birləşdirilməsi iddiaları ilə başladıqları müharibə bunu bir daha təsdiqlədi. Eyni zamanda azərbaycanlıların tarixi torpaqları sayılan Qərbi Azərbaycandan zorla deportasiya edilməsinə başlanılmışdı. Azərbaycanlılar həm Dağlıq Qarabağda, həm də Qərbi Azərbaycanda ağır təhqirlərə, fiziki-mənəvi işgəncələrə məruz qalır, onların ev-eşikləri yandırılır, qətlə yetirilirdilər. Xalqımız 1988-ci il noyabr ayının 17-də Azadlıq meydanına axışaraq ermənilərin bu qanunsuz və ədalətsiz hərəkətlərinə son qoyulmasını tələb etdi. 17 Noyabr xalqımızın tarixinə Milli Qurtuluş Günü kimi daxil oldu. Lakin mərkəzi hakimiyyət xalqımızın bu etiraz və narazılığına məhəl qoymadı. 1988-ci ilin dekabr ayında 250 mindən çox soydaşımızın Qərbi Azərbaycandan deportasiya edilməsi də xalqımıza qarşı yönəldilmiş bir cəza tədbiri idi. Üstəlik də, ölkə daxilində yaranan hərc-mərclik, özbaşnalıq vəziyyəti daha da ağırlaşdırırdı. Həmin tarixi zaman kəsiyində ölkə rəhbərliyində təmsil olunan şəxslərin səriştəsizliyi, bəzi hallarda isə milli maraqlarımıza xəyanət etmələri də faciələrin baş verməsinə şərait yaradırdı. Buna baxmayaraq, xalqımız öz milli istiqlalına qovuşmaq üçün yenilməz iradə, güc nümayiş etdirirdi. Xalqımızın öz azadlığı uğrunda fədakar mübarizə apardığını görən imperiya qüvvələri onu çökdürmək üçün hərbi gücdən də istifadə edirdilər. 1990-cu il yanvarın 19-dan 20-nə keçən gecə imperiya qoşunları Bakıda 20 Yanvar faciəsini törətdilər. Lakin xalqımız öz azadlığına doğru addım-addım irəliləməkdə davam edirdi. 1991-ci il avqustun 30-da parlamentdə «Azərbaycan Respublikasının dövlət suverenliyi haqqında Bəyannamə» qəbul edildi, bir qədər sonra isə, yəni 1991-ci il oktyabrın 18-də «Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı» qəbul edildi.

Ancaq tarixi düşmənimiz olan ermənilər öz havadarlarının köməyi ilə xalqımıza qarşı yeni faciələr, təxribatlar törətməkdə davam edirdilər. 1991-ci il noyabr ayının 20-də Qarakənd səmasında Azərbaycanın dövlət və hökumət nümayəndələrinin olduğu vertolyotun vurulması, 1991-ci il dekabr ayının 26-da baş verən Daşaltı uğursuzluğu, 1992-ci il fevralın 25-dən 26-na keçən gecə Xocalının yerlə-yeksan edilməsi, 1992-ci il aprel ayının 8-də Kəlbəcər rayonunun Ağdaban kəndinin büsbütün yandırılması, 1992-ci il mayın 8-də Şuşanın, mayın 18-də isə Laçının işğal edilməsi xalqımızın necə ağır və mürəkkəb bir vəziyyətdə yaşadığını və mübarizə apardığını göstərirdi. Torpaqlarımız əldən gedirdi, xalqımız sabaha ümidini itirmişdi. Belə ağır və faciəli durumda xalqın yeganə ümid, inam yeri isə, ulu öndərimiz Heydər Əliyev idi. Ümid dolu baxışlar Naxçıvana - ulu öndər Heydər Əliyevə yönəlmişdi. Vətənpərvər ziyalılarımız Azərbaycanı düşdüyü ağır vəziyyətdən xilas etmək üçün yeni bir siyasi partiya yaratmaq və onun rəhbərliyinə xalqımızın dahi oğlu Heydər Əliyevi dəvət etmək qərarına gəldilər. 1992-ci il oktyabr ayının 10-da «Əlincə Cəmiyyəti»nin iclasında bu partiyanın yaradılması və ulu öndər Heydər Əliyevə müraciət edilməsi qərara alındı. Bu müraciət 1992-ci il oktyabr ayının 16-da «Səs» qəzetində dərc olundu. Həmin müraciətə 91 nəfər millətsevər ziyalı - Azərbaycanın görkəmli alimləri, ictimai xadimləri imza atmışdılar. Qürur hissi ilə deyə bilərik ki, həmin 91 vətənpərvər ziyalıdan 11 nəfəri ADPU-nun müəllimləri olmuşdur.

Ulu öndər Heydər Əliyev 1992-ci il oktyabrın 23-də həmin müraciətə cavab verdi. Dahi liderimiz həmin cavabında Azərbaycanı düşdüyü faciəli vəziyyətdən necə çıxarmağın konkret yollarını göstərmişdi. Əslində, Ulu Öndərin bu cavabı proqram xarakterli bir çıxış idi. Beləliklə, 1992-ci il noyabr ayının 21-də Naxçıvanda ümummilli lider Heydər Əliyevin rəhbərliyi ilə YAP-ın təsis konfransı keçirildi. Xalqımızın böyük oğlu Heydər Əliyev yekdilliklə partiyanın sədri seçildi. "Yeni,müstəqil Azərbaycan uğrunda!" şüarı ilə siyasi mübarizə meydanına atılan YAP Ulu Öndərimizin rəhbərliyi altında xalqımızın müstəqillik uğrunda mübarizəsi tarixinə yeni, parlaq səhifələr yazdı. 1993-cü ilin iyun ayında isə müdrik siyasi xadim Heydər Əliyev xalqımızın böyük istəyi və təkidli tələbi ilə yenidən respublikamızda hakimiyyətə qayıtdı.

Rektor Y.Məmmədov çıxışına davam edərək qeyd edib ki, böyük və sürətli inkişaf yolu keçmiş YAP-ın yaradılmasından 22 il keçir. Tarix, zaman baxımından 22 il elə də böyük bir müddət deyil. Lakin bu müddət ərzində xalqımız həm YAP-ın yaradıcısı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin, həm də Ulu Öndərimizin müdrik dövlətçilik kursunun ən layiqli davamçısı, ölkə Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında həyatımızın bütün sahələrində böyük uğur və nailiyyətlər qazanmışdır. Bu gün öz sıralarında təxminən 640 minə yaxın məsləkdaşı birləşdirən YAP ölkəmizin ən güclü və ən nüfuzlu siyasi təşkilatıdır. YAP monolit partiyadır, cəmiyyətimizin avanqardıdır, qüdrətli siyasi qüvvədir. YAP eyni zamanda yalnız ölkəmizdə deyil, eləcə də Cənubi Qafqazda ən güclü siyasi partiyadır. YAP-la heç bir siyasi təşkilat nə sosial baza baxımından, nə intellekt səviyyəsi, nə də idarəetmə təcrübəsi baxımından əsla müqayisə edilə bilməz. YAP həm də bir beyin mərkəzi, bir intellekt mərkəzidir. Xalqımızın böyük elm və təhsil xadimləri, görkəmli ziyalıları məhz bu partiyada təmsil olunurlar.

YAP sözün həqiqi mənasında əməli fəaliyyət partiyasıdır. Sözlə əməlin vəhdəti YAP-ın fəaliyyətində öz gerçək təcəssümünü tapır. Geniş sosial bazaya malik olan YAP-ın sıralarında cəmiyyətin bütün təbəqələri təmsil olunur ki, bu da onun ümumxalq partiyası olduğunu söyləməyə tam əsas verir. Məhz bütün bu sadaladığım müsbət xüsusiyyətlərin nəticəsidir ki, YAP 1993-cü ildən bu günə kimi respublikamızda keçirilmiş 5 prezident seçkisində, 4 parlament və 3 bələdiyyə seçkisində parlaq qələbə qazanmışdır. YAP öz fəaliyyətində gənclərin və qadınların irəli çəkilməsinə, onların dövlət idarəçiliyində təmsil olunmasına xüsusi diqqət yetirir.

Tam əminliklə deyə bilərik ki, ulu öndərimiz Heydər Əliyevin elmi əsaslara söykənən müdrik siyasi kursunu uğurla davam etdirən Azərbaycan Prezidenti cənab İlham Əliyev həyatımızın bütün sahələrinin, xüsusilə də, iqtisadiyyatın dinamik inkişafını təmin etmişdir. Azərbaycan iqtisadiyyatı sürətlə inkişaf edir. Azərbaycan investisiya qoyulan ölkədən xaricə investisiya yatıran ölkəyə çevrilmişdir. Azərbaycan rəqabətədavamlılığa görə hazırda dünyada 38-ci yerdədir. Ölkəmiz iqtisadi cəhətdən tam müstəqildir və bu da dövlətimizə müstəqil xarici siyasət yürütməyə imkan verir.

Son illər Azərbaycanın beynəlxalq siyasi nüfuzu da xeyli yüksəlmişdir. Belə ki, Azərbaycan 2011-ci il oktyabr ayının 24-də 155 ölkənin yüksək etimadı və böyük siyasi dəstəyi ilə dünyanın ən nüfuzlu və mötəbər beynəlxalq qurumu olan Birləşmiş Millətlər Təşkilatının (BMT) Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilmişdir. Bu, Azərbaycanın böyük siyasi-diplomatik uğuru, nailiyyətidir. 2012-ci ilin may ayında isə ölkəmiz BMT Təhlükəsizlik Şurasına sədrlik edərək beynəlxalq təhlükəsizlik problemləri ilə bağlı uğurla fəaliyyət göstərdi. Ötən il oktyabr ayının 1-dən Azərbaycan yenidən BMT Təhlükəsizlik Şurasına sədrlik etməyə başladı və dünyada ədalətin, sülhün, əmin-amanlığın təmin edilməsi istiqamətində uğurla fəaliyyət göstərdi. Həmçinin beynəlxalq siyasi nüfuzu artan Azərbaycan bu ilin may ayında Avropa Şurasının Nazirlər Komitəsinə sədrlik etdi. Bu isə öz növbəsində Azərbaycan həqiqətlərinin, xüsusilə də, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması üçün əlverişli şərait yaratdı.

Azərbaycan möhtəşəm beynəlxalq tədbirlərin, sivilizasiyalararası dialoqların keçirildiyi bir məkana çevrilmişdir. Bu baxımdan, oktyabrın 2-3-də Heydər Əliyev Mərkəzində keçirilən IV Bakı Beynəlxalq Humanitar Forumunu xüsusi qeyd edə bilərik. Dünya miqyaslı bu Forumda 60 ölkədən 500-ə yaxın qonaq, o cümlədən müxtəlif sahələr üzrə Nobel mükafatına layiq görülmüş 10-dan çox tanınmış və nüfuzlu şəxs iştirak edirdi. Azərbaycan multikulturializm və tolerantlıq baxımından bütün dünya üçün layiqli bir örnəkdir.

Azərbaycan hazırda növbəti möhtəşəm beynəlxalq tədbirə ev sahibliyi etməyə hazırlaşır. 2015-ci ilin iyun ayında bəşəriyyət tarixində ilk dəfə keçiriləcək Avropa Olimpiya Oyunları Bakıda keçiriləcəkdir. Ölkəmizdə idman sahəsində həyata keçirilən uğurlu siyasət və eyni zamanda bu sahədə qazanılmış böyük təcrübə Azərbaycana bu möhtəşəm beynəlxalq tədbiri də yüksək səviyyədə keçirəcəyindən xəbər verir.

Xüsusi qeyd etmək istəyirəm ki, Azərbaycanda təhsil sahəsində bir sıra layihələrin çox uğurla həyata keçirilməsində ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Milli Məclisin deputatı, YAP-ın Sədr müavini, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva böyük xidmətlər göstərir. Mehriban xanım Əliyevanın fəaliyyətinin əsas istiqamətlərindən birini məhz təhsilə xüsusi qayğı və diqqət təşkil edir və onun bu fəaliyyəti ölkə ictimaiyyəti tərəfindən yüksək qiymətləndirilir.

Rektor Y.Məmmədov çıxışının bu məqamında deyib:"Məlum olduğu kimi, 2013-cü il oktyabr ayının 9-da ölkəmizdə növbəti Prezident seçkiləri keçirildi. Bütün dünya ictimaiyyətinin, beynəlxalq təşkilatların diqqətlə izlədiyi, 40 mindən çox müşahidəçinin, o cümlədən 1400-ə yaxın beynəlxalq müşahidəçinin izlədiyi Prezident seçkilərində cənab İlham Əliyev öz rəqiblərini böyük səs



çoxluğu ilə geridə qoyaraq xalqımızın böyük dəstəyi və etimadı ilə yenidən Azərbaycan Respublikasının Prezidenti seçildi. Cənab İlham Əliyev Prezident seçkilərində inamlı və möhtəşəm qələbə qazandı. Tam azad, ədalətli, şəffaf və demokratik keçirilən seçkilərdə xalqımız öz siyasi iradəsini ortaya qoyaraq cənab İlham Əliyevin nəhəng idarəçilik və dövlətçilik fəaliyyətinə yenidən yüksək qiymət verdi. Sonuncu Prezident seçkilərindən ötən 1 il ərzində də Azərbaycan bütün sahələrdə böyük uğurlara imza atdı. Bir sözlə, cənab İlham Əliyev xalqımızın alternativsiz lideri olduğunu bir daha əyani şəkildə sübuta yetirdi.

Hazırda YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk partiya təşkilatının təxminən 3170-dən çox üzvü var ki, onların da əksəriyyətini tələbə-gənclər təşkil edir. Müsbət bir haldır ki, Azərbaycan gəncləri ürəklərinin səsi ilə, böyük inam və həvəslə YAP-ın sıralarına daxil olurlar. Gənclərin belə seçim etməsinin səbəbi aydındır: onlar ölkəmizin hərtərəfli inkişafını, müasirləşməsini, dünyaya uğurla inteqrasiyasını yalnız Azərbaycan Prezidenti, YAP-ın sədri cənab İlham Əliyevin hərtərəfli idarəçilik və dövlətçilik fəaliyyətində görürlər. Bir faktı da xüsusi qeyd etmək istəyirəm ki, bu yaxınlarda ölkə əhalisi arasında keçirilmiş rəy sorğusunda əhalinin 83%-i birmənalı şəkildə dövlət başçısı İlham Əliyevi dəstəklədiyini bildirmişdir. Bu, qədirbilən xalqımızın, millətimizin cənab İlham Əliyevin çoxşaxəli və hərtərəfli fədakar fəaliyyətinə verdiyi növbəti yüksək qiymətdir. Bu il dekabr ayının 23-də ölkəmizdə növbəti bələdiyyə seçkiləri keçiriləcəkdir. İnanırıq ki, ölkəmizin aparıcı siyasi qüvvəsi olan YAP bu seçkilərdə də böyük üstünlüklə qalib gələcəkdir.

Çıxışımın sonunda isə sizi bir daha YAP-ın yaranmasının 22 illiyi münasibətilə təbrik edir, hər birinizə möhkəm cansağlığı, elm və təhsildə uğurlar, nailiyyətlər arzulayıram".

YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk partiya təşkilatının sədri, professor Himalay Qasımov konfransda "22 il-möhtəşəm tarix" mövzusunda məruzə ilə çıxış edib. Professor Himalay Qasımov bildirib ki, təsis konfransı 1992-ci il noyabrın 21-də Naxçıvan şəhərində reallaşan YAP 22 il ərzində çox möhtəşəm tarixi bir yol keçib. Azərbaycan xalqının istəyinin və ulu öndər Heydər Əliyevin iradi gücünün, müdrik, uzaqgörən siyasətinin gerçək nəticəsi olan bu partiya qısa bir zamanda ümumxalq sevgisi qazandı, sıraları kəmiyyət və keyfiyyət baxımından xeyli sıxlaşdı. Əslində, bu partiyanı yaratmaq ideyası da Ümummilli Liderin xilaskarlıq missiyasının tərkib hissəsi idi, özündə Azərbaycançılıq ideologiyasını ehtiva edən elmi-nəzəri, sosial-siyasi platforma idi. Partiyanın yarandığı tarixi dönəmdə Azərbaycan kəşməkəşli, son dərəcə mürəkkəb bir durumda idi. Ulu öndər Heydər Əliyev milləti bəlalardan, Vətəni parçalanmaqdan, daxili qarşıdurmalardan, çəkişmələrdən xilas etdi. Yeni, çiçəklənən Azərbaycanın memarı və qurucusu oldu, onu beynəlxalq aləmdə tanınan və təqdir edilən möhtəşəm bir ölkəyə çevirdi. Ulu öndər Heydər Əliyev XX əsrin dövlət xadimləri arasında müdrik tarixi şəxsiyyətlər səviyyəsinə yüksələn siyasi lider və böyük dövlət xadimi olaraq Azərbaycanın ən təlatümlü və çətin məqamında xalqın xilasına yetişdi.

Məlum olduğu kimi, hələ Sovetlər dönəmində Azərbaycana rəhbərlik etdiyi 1969-1982-ci illərdə Ulu Öndər ölkəmiz üçün çox böyük işlər gördü, Vətənimizin qabaqcıl respublikalardan birinə çevrilməsinə nail oldu. Xalqın rifahı naminə ölkədə yeni infrastruktur yaratdı, təhsil və istehsal müəssisələrinin inkişafını stimullaşdırdı. 1978-ci ildə Konstitusiyaya Azərbaycan dilinin dövlət dili olması ilə bağlı müddəanı daxil etdi. Bu, həmin dövr üçün çox nadir hadisə idi. Şübhəsiz ki, bütün bunları qədirbilən xalqımız hələ o zaman gördü və yüksək dəyərləndirirdi. Lakin 1988-1993-cü illərdə ölkədə tamamilə yeni bir vəziyyət yarandı. Bir tərəfdən, daxildəki siyasi hərc-mərclik, digər tərəfdən, Ermənistanın öz işğalçı niyyətini gerçəkləşdirməsi vəziyyəti xeyli gərginləşdirdi. Yeri gəlmişkən, bir məqamı da məxsusi vurğulayaq ki, Sovet hakimiyyəti illərində də bir çoxlarından fərqli olaraq Ulu Öndər ermənilərin məkrli niyyətlərindən xəbərdar idi və respublikaya rəhbərlik etdiyi həmin dövrlərdə Azərbaycan ərazilərinə qarşı erməni iddialarının qarşısını qətiyyətlə ala bilmişdi. Lakin Sovet İttifaqının süqutu ilə Ermənistanın millətçiliklə yoğrulan işğalçı siyasəti daha açıq şəkil aldı. Beləliklə, Ulu Öndərin qayıdışı ərəfəsində ölkədə vəziyyət böhranlı həddə çatmışdı. Ölkəyə həqiqi xilaskar gərək idi. Xalqda belə bir dərin inam yaranmışdı ki, Azərbaycanı düşdüyü məşəqqətli vəziyyətdən yalnız və yalnız Heydər Əliyev xilas edə bilər. Beləliklə, Heydər Əliyevin gəlişi ilə Azərbaycanda sabitlik təmin olundu, Ermənistan ilə atəşkəs barədə razılaşma imzalandı. Ulu Öndər eyni zamanda, ölkədə vətəndaş müharibəsi təhlükəsinin qarşısını aldı, müxtəlif kənar qüvvələrin Azərbaycanı parçalamaq istəyinin reallaşmasına imkan vermədi. Ulu Öndər dövrün geosiyasi, iqtisadi proseslərini nəzərə alaraq, müstəqil dövləti məhz elə təməlindən qurmağa başladı. Azərbaycan bu gün də Ulu Öndərin qoyduğu möhkəm təməl üzərində inamla irəliləyir.

Bu səbəbdən də hazırda ölkədə gerçəkləşən bütün uğurlarda ulu öndər Heydər Əliyevin, onun yaratdığı YAP-ın xüsusi xidmətləri var. Ulu Öndərin əsasını qoyduğu və Azərbaycan Prezidenti möhtərəm cənab İlham Əliyevin böyük uğurla davam etdirdiyi daxili və xarici siyasət kursu bu gün varisliyə ən bariz nümunədir. YAP-ın böyük coşğu ilə keçən V qurultayı, Azərbaycan Prezidenti cənab İlham Əliyevin partiyanın keçdiyi tarixi inkişaf yolu, qarşıda duran vəzifələr və bu vəzifələrin yerinə yetirilməsində partiya üzvlərinin və ümumən xalqımızın rolu barədə parlaq məruzəsi və bu mahiyyətdən qaynaqlanan tövsiyələri salonda əyləşənlərdə böyük ruh yüksəkliyi yaratdığı kimi, millətimizdə partiyamıza olan inamı daha da dərinləşdirdi.

(Davamı 4-cü səhifədə)

# Professor Allahverdi Verdizadənin 100 illik yubileyinə həsr olunmuş “Üzvi reagentlər analitik kimyada” mövzusunda II Respublika elmi konfransı

**Konfransın materialları öncədən nəşr edilib iştirakçılara çatdırılmış, iki gün davam edən konfransda 7 bölmədə 167 məruzə dinlənilmişdir.**

**Xatırladaq ki, bu mövzuda I Respublika elmi konfransı beş il öncə - 2009-cu ildə keçirilmiş, görkəmli alimin 95 illiyinə həsr olunmuşdu.**




Noyabr ayının 28-də ADPU-da böyük qələbəlik idi - AMEA-nın kimya elmi ilə bağlı strukturlarının nümayəndələri, Bakı, Sumqayıt, Gəncə və Naxçıvandan respublikamızın tanınmış kimyaçı alimləri ADPU-nun Böyük zalına toplaşmışdılar.

Konfransı giriş sözü ilə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov açmış, konfransın görkəmli kimyaçı alim, tanınmış mütəxəssis, yetirmələri tərəfindən həmişə səmimiyyət və minnətdarlıq hissi ilə xatırlanan bacarıqlı pedaqoq, mahir elm təşkilatçısı, kimya elmləri doktoru, professor Allahverdi Əmənulla oğlu Verdizadənin anadan olmasının 100 illik yubileyinə həsr olunduğunu söyləmişdir.

Rektor Y.Məmmədov öncə “Allahverdi Verdizadə kimdir?” sualını cavablandırmışdır. Adı Azərbaycanın görkəmli kimyaçı analitikləri ara-




sında şərəfli yer tutan professor A.Verdizadənin parlaq və zəngin bir həyat yolu keçdiyini, bu böyük insanın təkrarolunmaz şərəfli ömür yolunun gənc kimyaçılar nəsli üçün bir nümunə olduğunu söyləmişdir. Demişdir ki, A.Verdizadə 1914-cü ildə Azərbaycanımıza tanınmış simalar bəxş etmiş Cəbrayıl rayonunun Soltanlı kəndində anadan olmuş, 1930-cu ildə Füzuli şəhərində 2-ci dərəcəli məktəbi, 1933-cü ildə isə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU-nun) Təbiyyat-riyaziyyat fakültəsini (kimya-biologiya ixtisası üzrə) bitirmişdir. Bir neçə il rayon məktəblərində müəllimlik edəndən sonra Azərbaycan Sənaye İnstitutunda (indiki ADNA-da) pedaqoji fəaliyyətini davam etdirmiş, Böyük Vətən müharibəsi cəbhələrində (1941-1942-ci illərdə) döyüşmüş, cəbhədən dönəndən sonra yenə də (1946-cı ilə qədər) ADNA-da pedaqoji fəaliyyətlə məşğul olmuşdur.

Cəmi 59 il yaşamışdır. Ancaq çoxlarının qibtə edəcəyi ömür sahiblərindən olmuş, çoxlarının qibtə edəcəklərinə nail olmuşdur. 1945-ci ildə namizədlik (indi fəlsəfə doktoru), 1965-ci ildə doktorluq dissertasiyaları müdafiə etmiş, 1967-ci ildə ona professor adı verilmişdir.

59 illik ömrünün (1973-cü ildə vəfat etmişdir) son 27 ili (1947-ci ildən etibarən) məzunu olduğu APİ ilə bağlı olmuşdur. Paralel olaraq 1953-1954-cü illərdə Elmi-Tədqiqat Bərpaedici Cərrahiyyə və Ortopediya İnstitutunda Biokimya kafedrasının, 1959-1964-cü illərdə APİ-nin Ümumi kimya kafedrasının müdiri olmuşdur. 1969-cu ildə Analitik və fiziki kimya kafedrasını təşkil etmiş, ömrünün sonuna qədər həmin kafedraya rəhbərlik etmişdir.

Professor A.Verdizadənin rəhbərliyi altında kafedranın keçmiş SSRİ-nin elmi-tədqiqat və tədris müəssisələri ilə, eləcə də orada çalışan bir çox görkəmli alimlərlə sıx elmi əlaqələrindən bəhs edən rektor Y.Məmmədov A.Verdizadənin dünyanın qəbul etdiyi görkəmli alimlərini ((İ.Alimarin, A.Busev, İ.Korenman, S.Saavin, V.İvanov, N.Basarqin və bir çoxlarını) dəfələrlə rəhbəri olduğu kafedraya dəvət etməsindən, keçirilən seminarlarda analitik kimyanın müasir problemlərinə dair məruzələr dinlənildiyindən, dünyanın məhşur analitik-kimyaçı alimlərinin öz yaradıcıqlarında professor A.Verdizadənin elmi-tədqiqat işlərinin nəticələrinə geniş yer verməlırindən, akademiklərdən İ.Alimarin, H.Şahtaxtinski, İ.Korenman və A.Tananayevin onun elmi-tədqiqat işlərinin nəticələrini yüksək dəyərləndirdiklərindən, respublikamızın ali təhsil müəssisələrində və sənaye sahələrində çalışan bir çox tanınmış kimyaçı alimlərin bu sahə üzrə elmdə ilk addımlarını onun rəhbərliyi altında atdıqlarından, hazırda kafedraya A.Verdizadənin qızı, professor Nailə Verdizadənin rəhbərlik etdiyindən söz açmışdır. Fərəhləndiricidir ki, - demişdir, - əsası professor A.Verdizadə tərəfindən qoyulan bu elmi əlaqələr indi də uğurla davam etdirilir. Kafedranın elmi əlaqələri yalnız MDB ölkələri ilə məhdudlaşmır, dünyanın digər ölkələri (Türküyə, Bolqarstan) ilə də əlaqələri var.

Rektor Y.Məmmədov professor A.Verdizadənin qısa ömür yaşamasına baxmayaraq, Analitik kimyanın Azərbaycanda təşəkkül tapmasında xüsusi rolu olan üç nəfərdən biri olduğunu da diqqətə çatdırmış, bu sahəyə AMEA-da akademik Həbibbəy Şahtaxtinski ilə professor İsgəndər Bağbanlı, BDU-da professor Murtuza Əhmədli rəhbərlik etmişlərsə, APİ-də bu işin ağırlığının Allahverdi Verdizadənin çiyinlərinə düşdüyünü söyləmişdir. Onu da demişdir ki, A.Verdizadə 120-dən artıq elmi, elmi-metodik məqalə, 1 monoqrafiya, 16 dərslik, dərs vəsaiti və elmi-kütləvi kitabın müəllifi olmuşdur. Müəllifi olduğu kitablar indi də kimyaçı tələbələrin istifadəsindədir. 1959-cu ildə nəşr etdirdiyi “Vəsfi yarımmikrokimyəvi analiz” (I və II kitab) vəsfi analizə aid Azərbaycan dilində yazılan ilk və yeganə mənbədir. Müəllifi olduğu “Vəsfi analiz praktikumu (1972)”, “Vəsfi analizin nəzəri əsasları (1973)” və “Miqdari analiz praktikumu (1975)” dərs vəsaitləri indi də digər müasir dərslik və dərs vəsaitləri ilə yanaşı istifadə olunur. Abituriyentlər üçün qələmə aldığı “Kimyadan vəsait” kitabı bu gün də dəyərini saxlamaqdadır. Müəllifi olduğu analitik kimya dərsliklərindən ATU-da, ADNA-da, Azərbaycan Texnologiya Universitetində, Azərbaycan Dövlət Aqrar Universitetində və digər ali məktəblərdə həm müəllimlər, həm də tələbələr istifadə edirlər.

Bu zəhmətkeş alim, vətənpərvər insan Azərbaycanın kimya elmi aləmində silinməz iz qoymuşdur. Onun vaxtilə dərs demiş olduğu tələbələrin bir çoxu bu gün ölkəmizdə aparıcı alimlərdəndir.

II Respublika elmi konfransını Azərbaycan elmi ictimaiyyətinin professor A.Verdizadəyə verdiyi qiymətin parlaq nümunəsi kimi dəyərləndirən rektor Y.Məmmədov plenar iclasda daha üç məruzənin - “Professor Allahverdi Əmənulla oğlu Verdizadənin həyatı və elmi-pedaqoji fəaliyyəti” (məruzəçi akademik Vaqif Abbasov), “Kimyanin tədrisində “təhsildə dinamik fəzavi təfəkkür” nəzəriyyəsinin metodiki istifadə yolları” (məruzəçi AMEA-nın müxbir üzvü Mustafa Salahov) və “Bəzi d-elementlərinin -O, -S, -N tərkibli liqandlarla müxtəlif liqandlı komplekslərinin analitik xassələri” (ADPU-nun dosenti Əli Zalov) olacağını söyləmiş, çıxışının sonunda konfransın işinə uğurlar arzulamışdır.

* * *

“Professor Allahverdi Verdizadənin həyatı və elmi-pedaqoji fəaliyyəti”. AMEA-nın həqiqi üzvü, akademik Y.H.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun direktoru Vaqif Abbasovun məruzəsi bu mövzuda olmuşdur. V.Abbasov məruzəsində əsasən A.Verdizadənin iş prinsiplərindən, yetirmələrinə, tələbə və aspirantlarına göstərdiyi qayğıdan bəhs etmişdir: “Allahverdi müəllim kimə “əla” qiymət verirdisə, o, institutu bitirmiş hesab olunurdu. Bu gün mən 63 yaşındayam. Amma 59 il yaş yaşamış Allahverdi müəllimin ağsaqqallıq zirvəsinə baxıram və görürəm ki, o ağsaqqallıq zirvəsinə çatmaq çox çətindir. Biz bu gün kimya elmində qazandığımız uğurlara görə o nəslin nümayəndələrinə borcluyuq.

Ən böyük insanlar sənətinin mühitini yaradır, onu yaşadır və ona təkamül verir. Bu mühit onun özündən sonrakı yaşamını təmin edir. Allahverdi müəllim məhz belələrindən olub.

A.Verdizadənin kafedra müdiri olduğu dövrdə semestr imtahanından əlavə professor tapşırığı da var idi. Professor tapşırığını yerinə yetirməyən tələbə Analitik kimyadan imtahan verə bilməzdi.

Məndən soruşsalar ki, Azərbaycan kimya elmində bu gün hansı kimya vacibdir? Düşünmədən deyərəm ki, Analitik kimya. Ona görə ki, bütün sənaye sahələri - məişət kimyası, aqrokimya, neft kimyası... - hamısının başında Analitik kimya durur. Allahverdi müəllim Analitik kimyanı riyaziyyatsız təsəvvür etmirdi. “Riyaziyyatı bilməyən - Analitik kimyanı bilməz”-deyirdi. Və bizləri də məcbur edirdi ki, riyaziyyatı öyrənək. Onun özünün böyük uğurunun bir səbəbi də riyaziyyatı mükəmməl bilməsi olmuşdur. Axı Allahverdi müəllim Təbiyyat-riyaziyyat fakültəsini bitirmişdir.

Qələmə aldığı kitabların dili akademik dildən uzaq, o qədər sadə və başadüşülən idi ki, elə bilirdin bədii əsər oxuyursan.

Bu böyük insanın haqq-ədalət sahibi olduğunu təsdiq edən bir hadisə danışım. O dövrdə APİ-nin Kimya fakültəsinə Lenin təqaüdü verirdilər. İş elə gətirdi ki, Lenin təqaüdünə dörd nəfər təqdim olundu. Allahverdi müəllim bu vəziyyətdən qəribə tərzdə çıxış yolu tapdı. Onun təklifi ilə tələbələrin dördünə də eyni tapşırıq verildi. Biz üç nəfər qaralamaya yazdığımız müddətdə, yoldaşlardan biri birbaşa ağlamaya yazıb cavabı təhvil verdi. Bu hal Allahverdi müəllimin diqqətindən yayınmadı. Onda fakültənin dekanı Reyhan Əbdürrəhimova idi. Allahverdi müəllim sonda cavabları yoxladı və dekana fikrini belə bildirdi: “Bu il Kimya fakültəsində Lenin təqaüdü heç kimə verilməyəcək”.

Akademik V.Abbasov çıxışının bu yerində dedi: “Həmin il heç birimiz Lenin təqaüdü almadıq, amma biz dost olaraq qaldıq. Allahverdi müəllimin bu mövqeyi biz dörd nəfərin dostluğunu qoruyub saxladı.

1973-cü ildə mən dövlət imtahanı verəndə professor Məhərrəm Məmmədyarov dövlət imtahan komissiyasının sədri idi. Bilet çəkəndə Allahverdi müəllim dedi ki, sən fikirləşmədən, dərhal cavab verəcəksən. Bundan rəncidə qalan Məhərrəm müəllim məni çox sıxma-boğmaya saldı. Amma son nəticə bu oldu ki, sonra Məhərrəm müəllim məni bu gün işlədiyim AMEA-nın Neft-Kimya Prosesləri İnstitutuna işləməyə dəvət etdi. Əslində, mənim bu gün akademik adı almağımın səbəbi Allahverdi müəllimin o vaxt yaratdığı vəziyyət olub.

Allahverdi müəllimin böyük xidmətlərindən biri də budur ki, o, Azərbaycan kimya elminə Nailə xanım kimi övlad bəxş edib gedib.

Mən həmçinin onunla da qürur duyuram ki, Allahverdi müəllim doktorluq dissertasiyasını bu gün mənim işlədiyim AMEA-nın Neft-Kimya Prosesləri İnstitutunda müdafiə edib.

...Biz bu gün bu respublika elmi konfransını keçirməklə yalnız Allahverdi müəllimin ruhunu şad etmədik. Biz minlərlə Azərbaycan ziyalısını formalaşdıran müəllimlərin qarşısında baş əydik, onlara ehtiram göstərdik. Və gələcəkdə müəllim peşəsini seçən insanlara demiş olduq ki, müəllimlik - şərəfli peşədir. Bu peşəni sevsəniz, hər şeyiniiz olacaq.

İnsan var ki, xahiş edirsən sənə kömək etsin, insan da var, görür ki, sənin ehtiyacın var, özü sənin üstünə gəlir, sənə kömək əli uzadır. Allahverdi müəllim xahişsiz kömək edən insan idi. Bu mənada, mən onun ruhu qarşısında baş əyirəm”.

* * *

Daha sonra “Kimyanin tədrisində “Təhsildə dinamik fəzavi təfəkkür” nəzəriyyəsinin metodiki istifadə yolları” mövzusunda AMEA-nın Polimer Materialları İnstitutunun laboratoriya müdiri, AMEA-nın müxbir üzvü Mustafa Salahov məruzə etmişdir. “Bu nəzəriyyə kimya elminin bütün sahələrini əhatə edən bir elmdir, Təhsildə Dinamik Fəzavi Təfəkkür Nəzəriyyəsinə (TDFT) yiyələnməklə biz elmin bütün sahələrini daha dərindən dərk edə bilirik” -söyləyən professor M.Salahov 30 ildir bu nəzəriyyə ətrafında tədqiqatlar aparıldığını diqqətə çatdırmış, demişdir ki, hadisə və




faktlara belə yanaşma tərzi dərketmə zamanı incəliklərə varmadan ümumiləşmələr aparmağa imkan verir və aləmin dərk olunmasında tədqiqatçı əlverişli vasitə əldə etmiş olur.

***

ADPU-nun dosenti Əli Zalovun məruzəsi “Bəzi d-elementlərinin -O, -S, -N tərkibli liqandlarla müxtəlif liqandlı komplekslərinin analitik xassələri” mövzusunda olmuşdur. Dosent Ə.Zalov çıxışında demişdir ki, bugünkü məruzəsinin mövzusu əsası 100 illik yubileyini qeyd etdiyimiz professor A.Verdizadə tərəfindən qoyulan elmi məktəbin elimi-tədqiqat işlərinin məntiqi davamıdır. Biz müxtəlif d-elementlərinin azot, kükürd, və oksigen tərkibli üzvi maddələrlə əmələ gətirdikləri kompleks birləşmələri tədqiq etmişik. Bu elmi tədqiqatların əsasında yeni işlənmiş metodikalar müxtəlif təbii - neft, mazut, qudron, bitki və heyvan hüceyrələrində və sənaye obyektlərində - poladda, texniki suda və s. obyektlərdə dəmirin, kobaltın, nikelin, misin, titanın, vanadiumun mikromiqdarlarının təyininə tətbiq edilmişdir”- söyləyən natiq məruzəsini slaydlardan istifadə etməklə konfrans iştirakçılarına çatdıtmışdır.

Sonra dosent Əli Zalov Cəlilabad RİH-nin başçısı Əziz Əzizovun konfransın işinə təbrik məktubunu oxumuşdur.

* * *

Konfransda professor A.Verdizadə ilə bağlı xatirələr dilə gəlmiş, çıxışlar olmuşdur. Tələbələrindən Azərbaycan Texnologiya Universitetinin kafedra müdiri, professor Ələmdar Əlbəndov, BDU-nun kafedra müdiri, professor Əyyub Əzizov, ADPU-nun kafedra müdiri, professor Ələkbər Qurbanov, ADNA-nın professoru Allahyar Yolçiyev (məqamı ikən qeyd edim ki, A.Yolçiyevin çıxışı ilə maraqlananlar “Ekspress” qəzetinin 28.11.2014-cü il sayında “Böyük alim, unudulmaz müəllim” məqaləsini oxuya bilərlər) Allahverdi müəllimlə bağlı xatirələrini konfrans iştirakçıları ilə bölüşmüşlər. Tədbirdə çıxış edən şair-publisist, “Kredo” qəzetinin baş redaktoru Əli Rza Xələfli çıxışının sonunda “Cəbrayıla elegiya” şeirini oxumuşdur.

Sonda professor A.Verdizadənin qızı, ADPU-nun Analitik və fiziki kimya kafedrasının müdiri, professor Nailə Verdizadə çıxış etmiş, bugünkü tədbirə görə Təhsil naziri Mikayıl Cabbarova, AMEA-nın rəhbərliyinə, ADPU-nun rektoru, professor Yusif Məmmədova, həmçinin konfransın işinə qatılan hər kəsə minnətdarlığını bildirmişdir.

* * *

Bununla da plenar iclas başa çatmış, sonra konfrans işini bölmələrdə davam etdirmişdir.



**Ayətxan Ziyad,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

*Oqtay Sultanov-60*

# Tanınmış alim, istedadlı pedaqoq, fəal vətəndaş

**Qədim Roma filosofu Senekanın belə bir müdrik ifadəsi var: "İnsan ömrünün mənası onun uzunluğuna görə deyil, faydasına görə müəyyən edilir". Həqiqətən də, müdrik kəlamdır. Mübaliğəsiz deyə bilərik ki, həyat və fəaliyyəti yüksək qiymətləndirilən soydaşlarımızdan biri xalqımızın tanınmış tarixçi alimi, istedadlı pedaqoq, ləyaqətli ziyalı,fəal vətəndaş, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix fakültəsinin dekanı, tarix üzrə elmlər doktoru, professor, "Tərəqqi" medallı, Əməkdar müəllim Oqtay Balaqədəş oğlu Sultanovdur. Professor Oqtay Sultanovun gənc nəsil üçün layiqli nümunə olan mənalı həyat yoluna və elmi-pedaqoji fəaliyyətinə birgə nəzər salaq.**



Professor Oqtay Sultanov 1954-cü il noyabr ayının 3-də keçmiş Dəvəçi (indiki Şabran) rayonunda anadan olmuşdur. 1970-ci ildə Dəvəçi rayonundakı Tofiq Abbasov adına 1 nömrəli orta məktəbi bitirmişdir. 1970-1974-cü illərdə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU-nun) Tarix fakültəsində ali təhsil almışdır. Elə həmin ildən əmək fəaliyyətinə başlayan O.Sultanov ilk olaraq 1974-1977-ci illərdə Dəvəçi rayonunun Sincanboyat kənd səkkizillik və 2 nömrəli şəhər orta məktəblərində Tarix-ictimaiyyət müəllimi işləmişdir.

1977-1979-cu illərdə keçmiş Sovet Ordusunda hərbi xidmət etmişdir. Hərbi xidməti başa vurduqdan sonra 1979-1981-ci illərdə Dəvəçi Rayon Xalq Maarif Şöbəsində (indi RTŞ) metodist, 1981-1989-cu illərdə isə APİ-nin Elmi kommunizm və SSRİ tarixi kafedralarında baş laborant işləmişdir. O, 1985-ci ildə uğurla namizədlik dissertasiyası müdafiə edərək tarix elmləri namizədi (indi tarix üzrə fəlsəfə doktoru) alimlik dərəcəsi almışdır. 1989-1993-cü illərdə SSRİ tarixi kafedrasında yarımştat və tam ştat müəllim, 1993-1997-ci illərdə isə Türk və Şərqi Avropa xalqları tarixi və Tarixin tədrisi metodikası kafedrasında baş müəllim, dosent işləmişdir. 1994-cü ildə dosent elmi adına, 1996-ci ildə isə tarix elmləri doktoru (indi tarix üzrə elmlər doktoru) elmi dərəcəsinə layiq görülmüşdür.

1998-ci ildən professor olan O.Sultanov uğurlu elmi-pedaqoji fəaliyyətini davam etdirərək 1999-2011-ci illərdə Türk və Şərqi Avropa xalqları tarixi və Tarixin tədrisi metodikası kafedrasının müdiri olmuşdur. Bunlarla yanaşı, professor O.Sultanov 2003-2006-cı illərdə AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunda fəaliyyət göstərən ixtisaslaşdırılmış Müdafiə Şurasının sədr müavini olmuş, 2006-2009-cu illərdə isə həmin Şuranın üzvü kimi səmərəli fəaliyyət göstərmişdir. 2007-ci ildə ADPU-nun Tarix fakültəsinin dekanı seçilmişdir. Oqtay müəllim rəhbərlik etdiyi fakültədə elm və tədrisin yüksək səviyyədə qurulması, həmçinin daxili nizam-intizam qaydalarının qorunması üçün əzmlə çalışır.

Qeyd etdiklərimizlə bərabər, professor O.Sultanov 2003-2009-cu illərdə Milli Təhlükəsizlik Nazirliyinin Heydər Əliyev adına Akademiyadasında əvəzçiliklə professor vəzifəsini icra etmişdir. O, 2010-cu ildən bu günə kimi Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının Tarix ixtisası üzrə ekspertidir.

Istedadlı və tanınmış alim O.Sultanov eyni zamanda respublikamızda yüksəkixtisaslı elmi-pedaqoji kadrların hazırlanmasında da mühüm xidmətlər göstərmişdir. Belə ki, professor O.Sultanovun elmi rəhbərliyi ilə 13 fəlsəfə doktoru hazırlanmışdır. O, həmçinin 7 elmlər doktorluğu və 10 fəlsəfə doktorluğu dissertasiyaları üzrə opponent olmuşdur. Yüksək səviyyəli monoqrafiya və kitabların, çoxsaylı dəyərli elmi məqalələrin müəllifidir.

Vətəndaş-alim, professor O.Sultanov elmi-pedaqoji fəaliyyəti ilə yanaşı, respublikamızın ictimai-siyasi həyatında da fəal iştirak edir. O, ulu öndərimiz Heydər Əliyevin yaratdığı, qurduğu, təşkilatlandırdığı və Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin Sədri olduğu Yeni Azərbaycan Partiyasının fəal üzvlərindən biri kimi milli dövlətçiliyimizin qorunmasında və daha da gücləndirilməsində mühüm xidmətlər göstərir.

Professor O.Sultanovun elmi-pedaqoji fəaliyyəti ölkə rəhbərliyi tərəfindən yüksək qiymətləndirilmişdir. O, ölkəmizdə təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə "Tərəqqi" medalı ilə təltif edilmiş, 18 aprel 2012-ci il tarixli Sərəncamı ilə isə "Əməkdar müəllim" fəxri adına layiq görülmüşdür.

Noyabr ayının 3-də tanınmış alim, istedadlı pedaqoq, dəyərli ziyalı, əsl vətəndaş, fəal ictimai xadim, professor Oqtay Sultanovun 60 yaşı tamam oldu. Biz də bu əlamətdar yubileyi münasibətilə Oqtay müəllimi ürəkdən təbrik edir, ona möhkəm cansağlığı, elmi-pedaqoji və ictimai-siyasi fəaliyyətində yeni-yeni uğurlar arzulayırıq.

**Vaqif Əliyev,**
**Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent**

# Tarixi zərurətdən yaranan siyasi partiya

**(Əvvəli 2-ci səhifədə)**

Cənab İlham Əliyevin həmin qurultayda yekdilliklə yenidən Azərbaycan Respublikası Prezidentliyinə namizədliyinin irəli sürülməsi partiyanın nüfuz dairəsinin necə bir yüksələn xətlə artdığının göstəricisidir. Bu da xüsusi vurğulanmalıdır ki, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili Mehriban xanım Əliyevanın YAP-ın İdarə Heyətinin üzvü və partiya Sədrinin müavini seçilməsi xalqımız tərəfindən böyük sevinc hissi ilə qarşılandı. Bu YAP-la xalqın birliyinin parlaq təzahürü və beynəlxalq aləmdə qazanılan uğurların rəhni kimi dəyərləndirilir. Partiyamızın sıralarının sıxlaşması da bu baxımdan təbii və qanunauyğundur. Bakıda Beynəlxalq Humanitar Forumların keçirilməsi, Azərbaycanın BMT-nin Təhlükəsizlik Şurasına qeyri-daimi üzv seçilməsi, ölkə Prezidenti İlham Əliyevin Təhlükəsizlik Şurasının birinci iclasına sədrlik etməsi, Azərbaycanın birinci xanımı Mehriban Əliyevanın 2015-ci ildə Bakıda keçiriləcək ilk Avropa Olimpiya Oyunlarının Təşkilat Komitəsinin sədri seçilməsi və ölkəmizə böyük nüfuz gətirən bu mühüm beynəlxalq idman hərəkatının keçirilməsinə uğurla rəhbərlik etməsi xalqımızda dövlətimizə böyük inam yaratmışdır. YAP-ın üzvləri, ADPU-nun əməkdaşları olaraq, həm də bir vətəndaş kimi bu inkişafa sevinir və qürur duyuruq. Bu baxımdan, universitetimizdə də partiyamıza artan maraq, əlbəttə ki, təbii və qanunauyğundur. Çünki zəngin tarixi və yaşarlı ənənələri olan bu ali məktəbdə YAP-ın fəaliyyəti üçün münbit şərait yaradılmışdır və buna görə də həm tələbələrimiz, həm də professorlarımız partiyamızın sıralarına daxil olmaq üçün ərizə ilə müraciət edirlər. Bu göstərici partiyamızın böyük uğurlarından və ona olan dərin inamdan xəbər verir.

YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk partiya təşkilatı İdarə Heyətinin üzvü, professor Buludxan Xəlilov, "91-lər"dən professor Zahid Xəlil, dosent Allahverdi Hacıyev, həmçinin professor Oqtay Sultanov çıxışlarında partiyanın ölkənin ən güclü siyasi qüvvəsinə çevrilməsində ümummilli lider Heydər Əliyevin tarixi xidmətlərini önə çəkib, Ulu Öndərin siyasi kursunun bu gün partiyanın Sədri, dövlətimizin başçısı İlham Əliyev tərəfindən böyük uğurla davam etdirildiyini xüsusi vurğulayıblar.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

# Müəllimlərimiz beynəlxalq konfransda



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji fakültəsinin İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva və həmin kafedranın dosenti, Əməkdar müəllim Tamilla Vahabova bu il noyabr ayının 3-dən 8-dək Rusiya Federasiyasının Sankt-Peterburq şəhərindəki A.S.Puşkin adına Leninqrad Dövlət Universitetinin dəvəti ilə həmin universitetin əməkdaşlarının nümayəndə heyətinin tərkibində Finlandiyanın Tətbiqi Elmlər üzrə Saymen Universitetində elmi əməkdaşlıq sahəsində keçirilən görüşlərdə iştirak edərək bu sahədə müəyyən razılıqlar əldə etmişlər. Noyabrın 6-7-də isə onlar İoensuu şəhərindəki Şərq Universitetində keçirilən gənclərin beynəlxalq konfransında iştirak etmiş və müvafiq sertifikatlar almışlar.

Dosent Y.Rzayeva həmin konfrasda ingilis dilində "Miqrasiya və gənclik" mövzusunda çıxış edərək respublikamızda demokratiya quruculuğu sahəsində Azərbaycan gəncliyinin rolunu və mövqeyini açıqlamış, hərtərəfli inkişaf edən ölkəmizdə gənclərə dövlət səviyyəsində yaradılan geniş imkan və şəraitdən söz açmışdır. O, eyni zamanda xalqımızın ən böyük və ən ağrılı problemi olan Qarabağ münaqişəsindən, torpaqlarımızın 20%-nin erməni təcavüzkarları tərəfindən işğal edilməsindən, 1 milyondan çox soydaşımızın öz ata-baba yurdlarından didərgin düşmələrindən, bu münaqişə səbəbindən gənclərimizin elan olunmamış müharibəyə sürüklənmələrindən və nəticədə çoxlu sayda gənclərimizin torpaq uğrunda şəhid olmalarından, eyni zamanda dünya birliyinin münaqişəyə ikili standartlarla yanaşmasından ürəkağrısı ilə ətraflı məlumat vermişdir. Qeyd edək ki, dosent Y.Rzayevanın çıxışının mətni konfrans materiallarında çap edilmişdir.

**Mətbuat və informasiya şöbəsi**

# Biologiya fakültəsində 9 Noyabr - Dövlət Bayrağı Gününə həsr olunmuş tədbir keçirilib

İlk olaraq onu qeyd edək ki, Azərbaycanın Dövlət Bayrağı Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin müvafiq qərarı ilə 1918-ci il noyabr ayının 9-da təsdiq edilmişdir. Ulu öndər Heydər Əliyevin təşəbbüsü və təklifi ilə üçrəngli bayrağımız 1990-cı il noyabrın 17-də Naxçıvan Ali Məclisinin binasında dalğalandırılmışdır. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2007-ci il noyabrın 17-də Bakıda Dövlət Bayrağı Meydanının yaradılması haqqında, 2009-cu il noyabrın 17-də isə Dövlət Bayrağı Gününün təsis edilməsi haqqında sərəncamlar imzalamışdır. 2010-cu il sentyabrın 1-də Bakıda Dövlət Bayrağı Meydanının təntənəli açılışı olmuşdur. Azərbaycan Prezidentinin 2009-cu il 17 noyabr tarixli sərəncamına əsasən ölkəmizdə hər il 9 Noyabr - Dövlət Bayrağı Günü kimi qeyd edilir. Dövlət başçımız İlham Əliyev demişdir: "Bizim bayrağımız qürur mənbəyimizdir. Bizim bayrağımız canımızdır, ürəyimizdir. Bu gün Azərbaycanın hər bir yerində dövlət bayrağı dalğalanır. Azərbaycan ərazi bütövlüyünü bərpa edəndən sonra milli dövlət bayrağımız bu gün hələ də işğal altında olan torpaqlarda qaldırılacaqdır. Bizim bayrağımız Dağlıq Qarabağda, Xankəndidə, Şuşada dalğalanacaqdır. O günü biz hər an öz işimizlə yaxınlaşdırmalıyıq və yaxınlaşdırırıq. Eşq olsun Azərbaycan bayrağına!"



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) noyabrın 7-də 9 Noyabr - Dövlət Bayrağı Gününə həsr edilmiş tədbirdə də milli bayrağımıza olan böyük sevgi və bu sevgidən qaynaqlanan qürur duyğusu özünü parlaq şəkildə göstərirdi. Məlumat üçün onu da qeyd edək ki, Biologiya fakültəsinin Tələbə Gənclər Təşkilatının (TGT) Dövlət Bayrağı Gününə həsr olunmuş tədbiri Dövlət Himninin səslənməsi ilə bərabər tələbələrin hazırladıqları hərbi paradla başlayıb. Sonra aparıcılar - Fəridə Həsənli və Rəşad Zeynallı bayrağımız haqqında məlumat veriblər. Bədii-musiqili hissədən ibarət olan tədbirdə tələbə-gənclərin ifasında şeir parçaları səsləndirilib və rəqslər təqdim olunub. Ulu öndər Heydər Əliyevin Vətənimiz haqqında söylədiyi şeir parçası dinlənildikdən sonra Azərbaycanın tarixi bayraqları slayd vasitəsilə nümayiş etdirilib. Tədbirin proqramına uyğun olaraq yenidən pianino ifasında musiqilər səslənib, "Qarabağım mənim" səhnəciyi nümayiş etdirilib. Tədbirin sonunda ulu öndər Heydər Əliyevin tarixi sözləri və "Cəngi" sədası səsləndirilib.

Tədbirdə ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev, Biologiya fakültəsinin dekanı, professor Yusif Əhmədov, Botanika və Zoologiya kafedralarının müəllimləri, eyni zamanda digər fakultələrin professor və müəllimləri iştirak ediblər.

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin II kurs tələbəsi, TGT-nin fakültə sədri**

# Tariximizin dönüş nöqtəsi

## ADPU-da 17 Noyabr-Milli Dirçəliş Gününə həsr edilmiş tədbir keçirilib

Hər bir xalqın, millətin tarixində özünəməxsus şərəfli günlər olur. Bu baxımdan, 17 Noyabr-Milli Dirçəliş Günü Azərbaycan xalqının tarixində xüsusi yer tutur. Mübaliğəsiz deyə bilərik ki, həmin gün xalqımızın milli-azadlıq mübarizəsi və dövlətçiliyi tarixində mühüm rol oynamış, ölkəmizin müstəqil döv-




lət kimi formalaşması üçün dönüş nöqtəsi olmuşdur. 70 ildən çox keçmiş SSRİ-nin tərkibində öz dövlət müstəqilliyindən məhrum olmuş xalqımız məlum hadisələrdən sonra indiki Azadlıq meydanında milli birlik və vətəndaş həmrəyliyi nümayiş etdirmişdir. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) noyabr ayının 17-də Milli Dirçəliş Gününə həsr edilmiş tədbir də bu tarixi günün əhəmiyyətini özündə əks etdirirdi.

ADPU-nun Tələbə Gənclər Təşkilatının (TGT) təşəbbüsü və təşkilatçılığı ilə keçirilən 17 Noyabr-Milli Dirçəliş Gününə həsr edilmiş və bədii-musiqili hissədən ibarət olan tədbir Dövlət Himnimizin səsləndirilməsi ilə başlayıb. Tədbirdə çıxış edən ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev bildirib ki, 1988-ci il noyabrın 17-də xalqımız Azadlıq meydanına axışaraq Azərbaycanı uzun müddət müstəmləkə əsarətində saxlayan Sovet imperiyasına qarşı ilk etiraz səsini qaldırmışdır.

Azərbaycanın keçmiş Dağlıq Qarabağ Muxtar Vilayətində başlamış erməni separatizmini və terrorunu dəstəkləyən, ermənilərin Azərbaycana qarşı torpaq iddialarına rəvac verən, Azərbaycan xalqının hüquq və mənafelərini qorumayan bir rejimə qarşı kütləvi xalq hərəkatı məhz 17 noyabrda başlandı. Həmin gün Azərbaycan xalqı bir yumruq kimi sıx birləşərək bütün dünyaya sübut etdi ki, o, azad olmağa layiq xalqdır.

Qeyd edək ki, XX əsrin 80-ci illərinin ortalarından etibarən keçmiş SSRİ-də baş verən ictimai-siyasi proseslər nəticəsində Azərbaycanın müstəqillik qazanması üçün geniş imkanlar yaranmışdı. Ermənistanda və Qarabağın dağlıq hissəsində azəri türklərinə qarşı yönəldilmiş soyqırımı Sovet ordusu tərəfindən dəstəklənirdi. Təpədən-dırnağadək silahlanmış erməni quldurları əliyalın, dinc əhalini müdhiş bir amansızlıqla qətlə yetiridilər. Qaniçən vəhşilər heç kimə - qocalara, körpələrə, hətta hamilə qadınlara belə aman vermirdilər. Vəzifə kreslosunu qoruyub saxlamaq naminə mərkəzi hakimiyyət qarşısında yaltaqlanan və acizlik göstərən o zamankı kommunist rəhbərliyi xalqın və Vətənin həqiqi mənafeyi keşiyində dura bilmirdi.

Bütün bu ədalətsizliklərə və ərazi bütövlüyünə edilən qəsdlərlə razılaşmayan Azərbaycan xalqı 17 noyabrda ayağa qalxdı. Həmin günlərdə Sovet müstəmləkə rejimi şəraitində repressiyalara məruz qalmış milli şüur yenidən oyandı, özünüdərkə doğru bir dönüş başlandı.

Xalq hərəkatı təkcə Bakıda deyil, Naxçıvan, Gəncə və Lənkəranda da kütləvi xarakter aldı. Respublikamızın bütün şəhər və rayonlarını bürümüş qüdrətli xalq hərəkatı kommunist rejimini Azərbaycandan süpürüb atmaq təhlükəsi yaratmışdı. Xalq hərəkatı bütün əzəməti ilə göz qabağında idi. Bundan qorxuya düşən imperiya başçıları noyabrın 24-dən 25-nə keçən gecə Bakıya qoşun yeritdilər. Komendant saatı tətbiq olundu. Lakin xalq geri çəkilmədi. Sovet rejimindən Ermənistanda və Qarabağın dağlıq hissəsində erməni separatçılığına və terrorizminə son qoymaq, Azərbaycanın ərazi bütövlüyünü təmin etmək, sərvətlərimizin talan edilməsini dayandırmaq kimi tələblərlə başlamış bu hərəkat tezliklə Azərbaycanın müstəqilliyinə çağıran şüarlara keçdi.

Lakin qüvvələr hələ qeyri-bərabər idi. İmperiya daxildən laxlasa da, hərbi gücdən düşməmişdi. Qüvvələri gələcək azadlıq mübarizəsi üçün qoruyub saxlamaq lazım gəlirdi. Dekabrın 4-dən 5-nə keçən gecə Sovet Ordusu bu hərəkatı yatırmağa nail oldu. Minlərlə azadlıqsevər insanlar həbs edilərək zindanlara salındı. Lakin xalqın mübarizə əzmini qırmaq mümkün olmadı. Az sonra tarix öz sözünü dedi. Azərbaycan yenidən öz müstə-



qilliyinə qovuşdu. 17 noyabr isə xalqın milli-azadlıq hərəkatının başlanğıc günü - Milli Dirçəliş Günü kimi qeyd olunmağa başladı.

Tarixi həqiqət naminə qeyd edək ki, 1991-ci il oktyabrın 18-də yenidən öz dövlət müstəqilliyini bərpa edən Azərbaycan bir daha parçalanmaq və milli müstəqilliyini itirmək təhlükəsi ilə qarşılaşdı. Yalnız ulu öndər Heydər Əliyevin xalqın təkidli tələbi ilə yenidən hakimiyyətə gəlməsi bu təhlükəni aradan qaldırdı, ölkədəki xaos və qarşıdurmaya son qoyuldu. Müdrik siyasi xadim Heydər Əliyev müstəqil, hüquqi, demokratik, dünyəvi Azərbaycan dövlətini qurdu, gücləndirdi və onu beynəlxalq aləmdə nüfuzlu bir dövlətə çevirdi. Bu gün ölkəmiz Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin rəhbərliyi ilə həyatımıızın bütün sahələrində uğurla inkişaf edir, müasirləşir, daha da qüdrətli olur, onun beynəlxalq siyasi nüfuzu durmadan yüksəlir.

Tədbirdə müstəqil respublikamızın hərtərəfli inkişafı, dünyadakı rolu və Azərbaycanın böyük şəxsiyyətləri haqqında videoçarx nümayiş olunmuş, həmçinin tələbə-gənclər gitara və pianinonun müşayiəti ilə səhnəcik, şeir və milli rəqs nümunələri ifa etmişlər. Eyni zamanda 17 Noyabr-Milli Dirçəliş Gününə həsr olunmuş "Tariximizi yazanlar" adlı inşa müsabiqəsinin qaliblərinə, ayın fəal fakültə sədrlərinə diplom, sertifikat və qiymətli hədiyyələr verilmişdir.

Tədbirdə ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev, Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov, fakültə dekanları və professor-müəllim heyəti iştirak etmişdir.

**Mənsur QÜDRƏTOĞLU,**
**Gülnar BƏXTİYARQIZI**

# "Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi: erməni iftiraları və əsl həqiqətlər"

## ADPU-da bu mövzuda elmi-praktik konfrans keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) tələbə-gənclərin yüksək səviyyədə təhsil almaları ilə yanaşı, onların hərbi-vətənpərvərlik tərbiyəsinin gücləndirilməsinə də xüsusi diqqət yetirilir. Bu məqsədlə ADPU-da müxtəlif elmi-praktik konfranslar, dəyirimi masalar, müharibə və əmək veteranları ilə görüşlər və digər tədbirlər həyata keçirilir. ADPU-nun və Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının birgə təşkilatçılığı ilə noyabr ayının 13-də universitetin Böyük Akt zalında "Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi: erməni iftiraları və əsl həqiqətlər"mövzusunda keçirdiyi elmi-praktik konfrans da bu baxımdan diqqəti cəlb edir.

ADPU-nun professor-müəllimlərinin, tələbələrinin və Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının nümayəndələrinin, eləcə də Böyük Vətən və Qarabağ müharibəsi veteranlarının iştirak etdiyi tədbiri universitetin Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açaraq bildirmişdir ki, müstəqil ölkəmizin təhlükəsizliyi onun Silahlı Qüvvələrinin döyüş və hərbi-texniki hazırlığından çox asılıdır. Elə buna görə də gənclərin hərbi-vətənpərvərlik tərbiyəsinin səviyyəsinin yüksəldilməsi günün ən vacib vəzifələrindən biridir. Ulu öndərimiz Heydər Əliyev 1996-cı ilin fevralında Azərbaycan Gənclərinin I Forumunda söylədiyi nitqdə gənclərlə məşğul olan bütün təşkilatların, həmçinin ictimaiyyətin diqqətini bu mühüm məsələyə cəlb edərək demişdir: "Azərbaycan ərazisinin bir qisminin Ermənistan Silahlı Qüvvələrinin təcavüzü nəticəsində işğal edildiyinə, respublikamızın ərazi bütövlüyü pozulduğuna görə milli vətənpərvərlik prinsipi gərək körpəlikdən başlayaraq hər bir vətəndaşın həyat prinsipi, həyat qanunu, nizamnaməsi olsun".

Professor R.Baxşəliyev çıxışına davam edərək bildirmişdir ki, biz, həqiqətən, güclü ordu yaratmaq, xalqını, Vətənini, doğma torpağını canından artıq sevən gənclər yetişdirmək istəyiriksə, bu vacib işi körpəlikdən başlayaraq təhsilin bütün pillələrində - orta məktəbdə, ali məktəbdə, ailədə, cəmiyyətdə, hərbi hissələrdə davam etdirməliyik. Vətənimizin müqəddəsliyi, ölkəmizə hərbi təcavüz edən qonşu dövlətin xəbis niyyətləri haqqında söhbətlər ailə tərbiyəsinin ana xəttinə çevrilməlidir.

Hərbi-vətənpərvərlik tərbiyəsinin başlıca istiqamətlərindən biri kimi biz, tarixən xalqımıza düşmən olan məkrli erməni millətçilərinin bəd niyyətlərini gənclərimizə səbirlə izah etməli, lap kiçik yaşlarından uşaqlarımızın hafizəsində möhkəmlətməliyik. Yeniyetmə və gənclərin fiziki sağlamlığının qayğısına da elə uşaq yaşlarından qalmalıyıq. Fiziki tərbiyə uşaq və yeniyetmələrin yalnız onların sağlamlıqlarının qorunub saxlanmasında və möhkəm-



ləndirilməsində deyil, eləcə də hərbi xidmətə hazırlanmalarında da çox mühüm rol oynayır.

Azərbaycan Konstitusiyasında bütün vətəndaşların icbari təhsil hüququ təsbit edildiyindən uşaqların kompleks tərbiyə prosesinin ikinci və çox mühüm pilləsi orta təhsil müəssisələridir. Buna görə də ana tərbiyəsi ilə başlayan hərbi- vətənpərvərlik orta məktəblərdə daha yüksək və mütəşəkkil səviyyədə davam etdirilməlidir. Həm də bu işin təşkilində bütün məktəb kollektivi iştirak etməlidir. Dövlət rəmzlərimizin öyrədilməsi ilə yanaşı, hər bir fənn müəlliminin tədris prosesində Vətən haqqında, torpaq haqqında, onun müqəddəsliyi haqqında, mənfur düşmənlərimizin törətdikləri faciələr haqqında, xalqın dəyanətli oğullarının şəhidlik ucalığı haqqında geniş izahat işi aparması vacib istiqamətlərdəndir. Məktəblərdə ayrı-ayrı qəhrəmanlıq guşələri yaradılmalıdır.

Professor R.Baxşəliyev qeyd etmişdir ki, son illər ölkəmizdə hərbi- vətənpərvərlik tərbiyəsinin gücləndirilməsi sahəsində mühüm tədbirlər həyata keçirilir. Bu baxımdan, Milli Olimpiya Komitəsi yarandığı gündən uşaq idman bölmələrinin artmasını, idman bazalarının genişləndirilməsini, müxtəlif idman növləri üzrə ölkəmizin yeniyetmə və gənclərinin uğurlarını, eləcə də olimpiya oyunlarında respublikamızın uğurları bu işin canlı nümunəsi kimi qeyd edilməlidir.

Ümummilli lider Heydər Əliyev respublikamıza rəhbərlik etdiyi bütün dövrlərdə Azərbaycanda həyatın bütün sahələri kimi, idmanın da inkişafını daim diqqət mərkəzində saxlamışdır. Müasir dövrümüzdə bu işi daha da yüksək səviyyədə qaldıran Azər-



baycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevə dərin minnətdarlıq hissi ilə qeyd edə bilərik ki, günü-gündən inkişaf edən və qüdrətlənən Azərbaycan indi dünyanın hər yerində əsl idman dövləti nüfuzu qazanmışdır. Ölkəmizdə sağlamlıq və gümrahlıq mənbəyi olan bədən tərbiyəsi və idman məşğələlərinə, gənclərin asudə vaxtının səmərəli təşkilinə göstərilən daimi qayğı və diqqət, ən yaxşı idmançılarımızın mötəbər beynəlxalq yarışlara hazırlığı üçün yaradılan gözəl şərait öz bəhrəsini verməkdədir. Təsadüfi deyil ki, bu gün beynəlxalq idman dairələrində Azərbaycanın adı hörmətlə çəkilir, onun yetirmələrinin imkanları yüksək qiymətləndirilir.

Artıq idmançıların ixtiyarına 50 olimpiya idman kompleksi verilib və bunun nəticəsində gənclərin sevimli idman növləri ilə məşğul olmaq imkanları daha da artmışdır. Məhz müasir idman komplekslərimizin çoxluğu, onlarda yaradılan yüksək şərait sayəsində ayrı-ayrı beynəlxalq idman federasiyaları öz yarışlarının - dünya və Avropa çempionatlarının, olimpiya təsnifat sınaqlarının, "Qran-Pri" turnirlərinin təşkilini Azərbaycana etibar edir və hər dəfə yarışları yüksək səviyyədə keçirən idman təşkilatlarımızın gördükləri genişhəcmli işləri layiqincə qiymətləndirirlər.

Qeyd etmək lazımdır ki, ADPU-da "Gənclərin fiziki hazırlığı və çağırışaqədərki hazırlığı" ixtisası fəaliyyət göstərir. Xüsusi qeyd etmək istəyirəm ki, Vətənimizin ən ağır günlərində universitetimizin məzunları ölkəmizin müdafiəsinə qalxdılar. Məzunlarımız arasında Qarabağ müharibəsində yaralananlar, qəhrəmancasına həlak olanlar da var. Mirələkbər İbrahimov 1986-cı ildə Fiziki tərbiyə və gənclərin ibtidai hərbi hazırlığı fakültəsini bitirmiş, bir müddət hərbi müəllim işləmiş, sonra könüllü olaraq müharibəyə getmiş və qəhrəmancasına şəhid olmuşdur. Azərbaycanın Milli Qəhrəmanıdır. Oxuduğu məktəb onun adını daşıyır. Digər bir məzunumuz - Mətləb Quliyev də könüllü olaraq cəbhəyə getmiş və 1992-ci ildə həlak olmuşdur. Milli Qəhrəman Mətləb Quliyevin adını daşıyan Sumqayıt şəhərindəki 3 nömrəli orta məktəbdə onun abidəsi qoyulmuşdur. Başqa bir məzunumuz - Mürşüd Məmmədov isə polis mayoru idi. O, 1994-cü il yanvarın 24-də Murovdağ uğrunda döyüşlərdə qəhrəmanlıq göstərmişdir. Ölümündən sonra ""Azərbaycan Bayrağı" ordeninə layiq görülmüşdür. Digər bir məzunumuz - Malik Bayramov da ölümündən sonra "Azərbaycan Bayrağı" ordeninə layiq görülmüşdür. Məzunlarımız Salman Abbasov, Ehtiram Hüseynov, İlqar Salmanov, Hilal Ələkbərov, İsfəndiyar Əsədov, Mirağa Kərimov, Nadir Qasımov, İntiqam İsmayılov, E.Ə.Qədirov, A.M.Rzayev, B.M.İsmayılov və başqaları hərbi peşələrinə sadiq qalmışlar.

Elmi-praktik konfransda çıxış edən Respublika Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatı sədrinin müavini, ehtiyatda olan polkovnik Cəlil Xəlilov əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulan dövlət gənclər siyasətini Azərbaycan Prezidenti İlham Əliyevin uğurla davam etdirdiyini bildirib. Silahlı Qüvvələrimizin döyüş qabiliyyətinin yüksəldilməsi istiqamətində uğurlu işlərin həyata keçirildiyini qeyd edən C.Xəlilov gəncləri vətənpərvərliyə çağırıb.

Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının sədri, general-mayor Dadaş Rzayev ölkəmizdə gənclərin inkişafına dövlət səviyyəsində göstərilən yüksək qayğı və diqqətdən danışıb, eyni zamanda tələbə-gəncləri maraqlandıran sualları cavablandırıb.

Respublika Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının Beynəlxalq əlaqələr və xalqlar arasında dostluq daimi komissiyasının sədri Zahiddin Abbasov və Yasamal rayon təşkilatının sədri Almaz Qasımova çıxış edərək təcavüzkar ermənilərin işğalçılıq siyasətini əks etdirən konkret faktları tədbir iştirakçılarının diqqətinə çatdırıblar.

Tədbirdə təhsildə əldə etdikləri yüksək nailiyyətlərə və ictimai-siyasi həyatda fəal iştirak etdiklərinə görə ADPU-nun 5 nəfər tələbəsi təşkilatın fəxri fərmanları ilə təltif edilmişdir.

**"Gənc müəllim"**

*Oqtay Rza-80*

# Sözlə cəngdə yaşayan ömür sahibi

***“Oqtay Rza” deyəndə öncə söz yada düşür. Ona sahib duranı ucalığa qaldıran, dünya durduqca əbədilik bəxş edən söz.***

***80 illik ömür yaşamının 68 ilini sözə mehir salıb, sözlə cəngdə-cidalda olub. Özü də iri yaşlarından yox, hələ orta məktəbin V sinifində təhsil aldığı zamandan, “Sosializm yolu” adlı Salyan rayon qəzetində dərc olunmuş ilk şeirindən. “1 May” adlı ilk qələm təcrübəsi məktəbli Oqtayın poetik durumlarına çıraq tutub, ömür yolunda mayaka çevrilib bugünki 80 yaşına qədər onu müşayiət edib. Və beləcə, sözlə mehirləşə-mehirləşə, sözlə cəngdə-cidalda ola-ola onları bir-birinin yanına düzüb misralara çevirib. Bu misraları zaman-zaman top edib kitablara sığışdırıb. Özü də nə az-nə çox - bir-birindən fərqli həcmdə 20 kitablıq söz yazıb. Haqqı var ki 80 yaşının bu kəhkəşanında ötənlərə boylana və “neyləmişəm?” dediyində 20 şeirlər kitabının adını birdən sadalaya. Ötən il nəşr etdirdiyi iki söz xəzinəsindən (“Adlı, ünvanlı misralar”) birini bu sıralama ilə elə beləcə də adlandırıb: “İyirminci kitabım” (Qürur duyuram ki, bu kitabın çapa hazırlanmasında mənim də payım var).***





“Şair Oqtay Rza”nı, yaxud “müəllim Oqtay Rzanı” bu gün Azərbaycanda kim tanımır? Bütün təbəqələrdən olan insanlar, o cümlədən Vətən sərhədlərinin keşiyində duran əsgərlər görüşlərinə getdiyi vədələrdə oxuduğu şeirlərindən, məktəblilər dərsliklərə daxil edilmiş təbiət hadisələrinə və cismlərə həsr etdiyi şeir nümunələrindən, bəstəkarlar, müğənnilər və musiqi həvəskarları isə sözlərinə bəstələnmiş mahnılardan.

İlk baxışda sakit təbiətli, ağır-salğar, ehtiyatlı-ehtiramlı yerişli, həmişə qayğılı görünən bu insan söz alıb tribunaya qalxanda ilk “Həzərat!” müraciəti ilə tamam özgələşir, odlu-alovlu, çılğın söylədiklərini ona qulaq kəsilən hər kəsə kəlmə-kəlmə diqtə etməyə müyəssər söz sahibinə çevrilir.

Barmaq hesabı aparsaq, ilk şeirinin çap olunduğu vaxtdan 68 illik bir zaman ötür - mükəmməl insan ömrü! Oqtay Rza üçünsə poeziya ilə dolu bir yaşam! Bu yaşam ona Azərbaycanımızın bütün bölgələrindən tanışlar, Oqtay Rzanın özü üçünsə “Oqtaysevərlər” kəlməsinin qürurunu bəxş edib, adını Azərbaycan ədəbiyyatına yazıb, imzasını Azərbaycan şairləri sırasında əbədiləşdirib, gələcək nəsillər üçün (hələ ki) 20 kitabını və müəyyən səbəblər üzündən nəşr etdirə bilmədiyi Dövlət Arxivində qorunan əlyazmalarını yadigar qoyub.

Elə bu üzdən dedim ki, “Oqtay Rza” deyəndə öncə onun nə geoloq olmağı (1956-cı ildə Azərbaycan Sənaye İnstitutunun (indiki ADNA-nın) Geoloji kəşfiyyat fakültəsini fərqlənmə diplomu ilə bitirib, 1985-ci ildə geologiya-mineralogiya elmləri namizədi (indi fəlsəfə doktoru) elmi adına yiyələnməsi), nə 1980-ci ildə Azərbaycan KP MK yanında Marksizm-Leninizm İnstitutunu fərqlənmə diplomu ilə bitirməyi, nə də “Əməkdar müəllim” adına layiq görülməsi - bunların heç biri yox, hər haldan öncə “şair Oqtay Rza” anlamı, söz sahibi olduğu yada düşür.

Ömrünün təhsil və elm ilə bağlılığını da nəzərə alsaq, dərslik, dərs vəsaiti və tədris proqramları da daxil olmaqla 24 kitabın müəllifidir. Əsərləri xarici mətbuatda çap edilmiş, “Kamennıy svetilcnik” şeirlər toplusu 1987-ci ildə Moskvada kütləvi tirajla işıq üzü görmüşdür.

Beynəlxalq Rəsul Rza, Mikayıl Müşfiq, Məmməd Araz, “Qızıl qələm” (1971-ci ildən) və Cəfər Cabbarlı mükafatları laureatıdır.

1981-ci ildən Azərbaycan Yazıçılar Birliyinin üzvüdür.

* * *

Noyabr ayının 27-də ADPU-da Filologiya və Coğrafiya və çağırışaqədər hazırlıq fakültələrinin birgə təşkilatçılığı ilə düzənləmiş toplantı bu niyyətə - ilmə-ilmə, pillə-pillə söz ucalığının zirvəsinə yetişib bu ucalıqda qərarlanan 80 yaşlı Oqtay Rza poeziyasının işığına köklənmişdi. Yubiey tədbirinə şairin dostları, söz-sənət dünyasının təəssübkeşləri, ADPU-nun Oqtay Rza yaradıcılığının şirinliyində ovsunlanan müəllim və tələbələri təşrif buyurmuşdular - bu sevuncə fərəh qatan hər kəsin ürək sözünü dinləməyə, şairin keşməkeşli ömür yoluna daha yaxından bələd olmağa, poetik nümunələrini bir daha onun öz dilindən eşitməyə.

Filologiya fakültəsi tələbələrinin ifasında səslənən və sözlərinə yazılmış mahnılarla müşayiət olunan xoş ovqatlı, sözlü-musiqili tədbiri ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov açmış, yubilyara ADPU-nun rektoru AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun təbrikini çatdırmış, rektorun əmri ilə şairin bir aylıq vəzifə maaşı ilə mükafatlandırıldığını söyləmiş, universitetin Fəxri Fərmanını ona təqdim etmişdir. Universitet Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev də Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin sədri, millət vəkili Səttar Mehbalıyevin təbrikini çatdırmış, yubilyarın Komitənin Fəxri Fərmanı və pul mükafatı ilə mükafatlandırıldığını qeyd etmişdir. Eyni zamanda AMEA-nın prezidenti, akademik Akif Əlizadənin, Dövlət Torpaq və Xəritəçəkmə Komitəsinin sədri, akademik Qərib Məmmədovun, AMEA-nın Neft-Kimya Prosesləri İnstitutunun direktoru, akademik Vaqif Abbasovun, ARDNŞ-in I vitse-prezidenti, akademik Xoşbəxt Yusifzadənin və Şirvan Şəhər İcra Hakimiyyətinin başçısı Mərdan Camalovun salamlarını da Oqtay Rzaya çatdırılmışdır.

Tədbirdə “Yazıçı” nəşriyyatının direktoru Şəmsi Vəfadar, ADPU-nun Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Mətanət Əsgərova, AZTV-nin diktoru, Əməkdar mədəniyyət işçisi Eldost Bayramlı, “Vəfa” jurnalının təsisçisi və redaktoru Xuraman Vəfa, şair-dramaturq Ramiz Abdullayev, ARDNŞ-in I vitse-prezidenti Xoşbəxt Yusifzadənin müşaviri Ələkbər Şəhrili, yazıçı-publisist Əlövsət Bəşirli, saz-söz sərrafı Hacı Loğman, şair-jurnalist Yusif Nəğməkar çıxış etmiş, şairə təbriklərini çatdırmışlar.

2014-cü ilin Qismət ayının - noyabrın 27-nin onun üçün rübə, fəsilə bərabər olduğunu dilə gətirən yubilyar - şair Oqtay Rza sonda çıxış edərək 80 yaşının belə təntənə ilə qeyd olunmasına diqqət və qayğı göstərdiyinə görə ADPU-nun rektoru, professor Yusif Məmmədova, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilova, yubiley tədbirinə qatılmış hər kəsə sonsuz məhəbbət və minnətdarlığını bildirmişdir.

* * *

***...Ömrümüzdə bir Oqtay Rza var.***
***“Ömür-gün bağımda az-maz barım var,***
***Düzdə bərəkətim, dağda qarım var,***
***Nəvə-nəticəli yaşıdlarım var -***

Mən indi babayam, ahıllıq yaşım!” kəlmələrinin ötkəm şirinliyi ilə bundan sonrakı zamanlarda qələmə alacağı şeirləri, tribunalardan etdiyi məhz ona məxsus “Həzərat!” müraciət tərzi və telefon zənglərində eşitdiyimiz “Salam, əziz dost!” kəlmələri ilə Böyük Yaradanın ona bəxş etdiyi ömür payının 81-ci pilləsinin ucalığında ləngər yerişli təhəri ilə addımlayan, hələ nə qədər illər bundan sonra da bizimlə olacaq səmimi şair, gözəl pedaqoq, təmənnasız dost!

**80 yaşın mübarək, Oqtay Rza!**

Hələlik isə “Yazıçı” nəşriyyatında çapa hazırlanan 21-ci kitabının təqdimatında görüşənədək”, əziz dost!

**Ayətxan Ziyad,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

# Stressin imtahanqabağı tələbələrin orqanizminə mənfi təsiri

Biz bilərəkdən və bilməyərəkdən gündəlik məişətimizdə stresslə rastlaşırıq və ya istəmədən ona düçar oluruq. Işə, məktəbə, universitetə və sair yerlərə gedərkən tıxaclara düşür, sürücülər tərəfindən lüzumsuz səs siqnallarının verilməsi ilə qarşılaşırıq. Eyni zamanda sürücülərin maşınları səkilərinin üstündə saxlaması vətəndaşları maşın yolu ilə getməyə təhrik edir. Yol hərəkəti qaydalarını pozulması piyadaları stress vəziyyətinə salır.

Gündəlik məişət zəminində müxtəlif səbəblərdən tez-tez stress vəziyyətinə düşürük. Nikbin insanlar stress vəziyyətinə düşərlərsə, onlar bu vəziyyətdən tez çıxa bilirlər. Bu da ondan irəli gəlir ki, onlar daim əhval-ruhiyyələrini yüksək səviyyədə saxladıqlarına görə alınmış stressləri yaddaşlarında saxlamırlar. Belə olan halda insan orqanizmində fizioloji proses rəvan gedir və orqanizmdə heç bir fəsadın yaranma ehtimalı olmur. Bədbin insanlar isə hər hansı bir mənfi bir qıcığa qarşı həssas olurlar və onu hafizələrində daim yaşadırlar.

Əlbəttə, belə bir lüzumsuz həssaslıq gələcəkdə orqanizmdə fəsadlar yaratmağa zəmin yaradır. Bu isə orqanizmin müdafiə qabiliyyətinin zəifləməsinə gətirib çıxarır.

Stress vəziyyətinə düşən insanların yuxusu pozulur, hafizəsi zəifləyir, əsəbi olur və onlar cəmiyyətdə mənfi psixoloji mühit yaradırlar. Belə insanların əmək qabiliyyəti aşağı düşür. Tələbələrdə isə hafizə zəifləyir, qavrama çətinləşir (kütləşir və ya tormozlaşır) və özlərini pis hiss edirlər. Həyatdan küsür və hər hansı bir hadisəyə biganə qalırlar. Beləliklə, yığılan kiçik stresslər nəticədə sinir sistemi xəstəliyinə səbəb ola bilər. Yuxarıda qeyd etdiklərimdən uzaq olmaq üçün ilk növbədə sağlam həyat tərzi keçirmək lazımdır.



Böyük alim və mütəfəkkir Nəsirəddin Tusi demişdir: “Bədənin xüsusiyyəti ölmək, orqanizmin xüsusiyyəti yaşamaqdır”. Əgər tənbəllik edilərsə, bədən oturmağa, uzanmağa və həddən artıq istirahətə meyillilik göstərəcək. Tənbəllik özü bir xəstəlikdir. Onun qarşısını yalnız fiziki və zehni əməklə almaq olar. Onsuz da bütün dünyada ekoloji tarazlıq itir, qəbul etdiyimiz qida məhsulları süniləşir, texnika insanları fiziki əməkdən uzaqlaşdırır. Təəssüflər olsun ki, son zamanlar telelekanallardan hər saat verilən pis xəbərlər də insanları bədbinliyə doğru yönəldir və bu da stresslərin yaranmasına səbəb olur. Stressdən qaçmaq üçün nikbin insanlarla ünsiyyət saxlamaq, vaxtında qidalanmaq, bədən tərbiyəsi ilə məşğul olmaq lazımdır.

Yuxu insan orqanizmi üçün ən mühüm amillərdən biridir, çünki orqanizmin bərpası üçün yuxu zəruridir. Bir sözlə, rəvan bəyan tərzi keçirmək insanın öz əlindədir.

Bir müəllim kimi müşahidələrim mənə belə deməyə əsas verir ki, tələbələr imtahan dövründə psixoloji sıxıntı keçirirlər. Müşahidələrimdən bu qənaətə gəlmişəm ki, imtahana yaxşı hazırlaşan tələbələrin əhval-ruhiyyələri yaxşı olur, onlarda heç bir psixoloji gərginlik yaranmır. Onlar stress vəziyyətinə düşmədiklərinə görə özlərini gümrah, sərbəst, şən və nizam-intizamlı aparırlar. Son nəticədə qarşıya qoyduqları məqsədlərinə rahatlıqla çataraq yüksək nəticələr əldə edə bilərlər.

O, tələbələr ki, imtahana əzbərçiliklə hazırlaşırlar, onlarda imtahan vaxtı böyük narahatçılıq yaranır. Xüsusən də, cavab mətninin hər hansı bir hissəsini yaddan çıxarırsa, öz tələbə yoldaşlarından kömək istəməklə, onları düşünməkdən yayındırırlar. Beləliklə, imtahan prosesinin gedişini pozmağa cəhd göstərmiş olurlar. Belə tələbələr heç bir tərəfdən köməklik görməyəndə əhval-ruhiyyələri pozulur.

Imtahana heç hazırlaşmayan bu tip tələbələr imtahan vaxtı müxtəlif qanunsuz vasitələrdən istifadə etməyə imkan tapmayanda ümidləri kəsilir və imtahandan könüllü olaraq çıxmağa məcbur olurlar.

Bütün bu çətinlikləri dəf etmək üçün mənim tövsiyəm ondan ibarətdir ki, mühazirəni yazarkən diqqətli olmaq, hər hansı qaranlıq bir məqamı müəllimdən soruşmaq məqsədəmüvafiqdir. Dərsdən qayıdıb nahar etdikdən sonra passiv və ya fəal istirahətdən sonra yazılmış mühazirəni oxumaq və köməkçi ədəbiyyatlardan isitifadə etmək lazımdır. Şam yeməyindən 2-3 saat sonra, yatmazdan əvvəl 30-40 dəqiqə təmiz havada gəzmək və yaxud passiv gimnastika hərəkətləri ilə məşğul olmaq lazımdır. (tənəffüsə fikir verməklə)

Səhər yuxudan durarkən səhər gimnastikası ilə məşğul olmaq, özünü yüngül formada masaj etmək yerinə düşər. Səhər naharından sonra vaxt qalarsa, keçilmiş mövzuları nəzərdən keçirmək məqsədəuyğun olar.

Asudə vaxtlarında bədən tərbiyəsi və idmanla məşğul olmaq bu gün və yaxud sabah yarana biləcək problemlərdən qaçmaq üçün ən faydalı vasitələrdən biridir. Sağlam bədəndə sağlam da ruh olar.

Bütün bunlarla yanaşı, hər iki tərəfə - müəllim və tələbələrə tövsiyəm ondan ibarətdir ki, imtahanda əhval-ruhiyyəni müsbət notlar üzərində kökləsinlər. Stress vəziyyətinə düşməmək üçün isti müəllim-tələbə münasibətini qurmaq lazımdır. Müəllim həmişə tələbə üçün şəxsi nümunə olamlıdır. Bunu da demək yerinə düşər ki, hörmətli rektorumuz, AMEA-nin müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov həmişə tələbələrin hüquqlarını qoruyaraq deyir ki, imtahanlar ədalətli, şəffaf və obyektiv keçirilməlidir. Cəsarətlə demək olar ki, hörmətli rektorumuz Yusif müəllim respublikamızda semestr imtahanlarının test üsulu ilə, kompyuter vasitəsi ilə keçirilməsinin ilk təşəbbüskarı olmuşdur. Bu müsbət metodun sonradan respublikamızın digər ali məktəblərində geniş tətbiq edilməsinə başlanılmışdır.

Bu üsulla keçirilən semestr imtahanları cəmiyyətdə xoş əks-səda yaratmışdır. Biz professor-müəllim heyəti, eləcə də tələbələr imtahanların bu üsulla keçirilməsindən razıyıq. Buna görə də universitetimizin rektoru, professor Yusif Məmmədova öz dərin təşəkkürümüzü bildiririk.

**Tofiq Cəbrayılov,**
**Bədən tərbiyəsi və idman kafedrasının baş müəllimi, beynəlxalq dərəcəli hakim**

# Pedaqoji fakültənin tələbələri Xalça Muzeyində olublar

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji fakültəsinin tələbələri asudə vaxtlarını səmərəli keçirmək üçün Bakı şəhərinin gəzməli və görməli yerlərinə səyahət etməyi xoşlayırlar. Bu günlərdə fakültənin II kurs 201-ci qrup tələbələri Azərbaycan Xalça Muzeyində oldular. Məlum olduğu kimi, muzey artıq yeni binada fəaliyyət göstərir. Dənizkənarı Milli Parkda Beynəlxalq Muram Mərkəzinin yaxınlığında yerləşən muzey binası bükülmüş xalça şəklində inşa edilib. Elə görünüşü kimi, muzeyin yeni tərtibatı da çox gözəldir. Muzeydə tarixin müxtəlif dövrlərinə aid xalça nümunələrinə rast gəlmək mümkündür. Biz xalçalar haqqında nə qədər məlumatlı olsaq da, muzeydə xalçaları canlı görüb, onlar haqqında ətraflı məlumat aldıq. Həqiqətən də, Azərbaycan xalçaçılıq də nümayiş etdirilən ekspozisiya çox böyük maraq doğuracaqdır: "Çünki muzeydə 15 minə yaxın eksponat var. Burada həm ekspozisiya çox orijinal tərzdə nümayiş etdirilir. Mən burada tikinti zamanı dəfələrlə olmuşam. Bütün işlər ən müasir səviyyədə qurulub və burada həm daxili tərtibat, bizim milli sərvətimiz olan xalça nümunələri, eyni zamanda nadir memarlıq birləşir və bu, məni çox sevindirir. Çünki bu, bizim xalqımızın nə qədər istedadlı xalq olduğunu bir daha göstərir. Çünki xalça bizim milli sənətimizdir. Biz hesab edirik ki, Azərbaycan xalça sənətinin vətənidir, xalça muğam, memarlıq abidələri kimi bizim milli dəyərimizdir, sərvətimizdir. Təsadüfi deyil ki, muzeyin tikintisinə başlayandan sonra bizim təşəbbüsümüzlə Azərbaycan xalçaçılıq sənəti UNESCO-nun qeyri-maddi irsi



sənəti dünya incəsənətinin incilərindəndir. Muzeydəki müxtəlif bölgələrimizə aid fərqli ornamentli xalçalar qrup yoldaşlarımızın diqqətini cəlb etdi. Bu muzey gəzintisində Azərbaycan xalçaları haqqında bir çox məlumatlar əldə etdik. Muzeyin bələdçisi bizə məlumat verdi ki, Azərbaycan Xalça Muzeyi 1967-ci ildən fəaliyyət göstərir. İlk dəfə Muzey İçərişəhərdə "Cümə məscidi"nin binasında yerləşib və onun ilk ekspozisiyası 1972-ci ildə açılıb. 1991-ci ildə Xalça Muzeyi Muzey Mərkəzinə köçürülüb. Muzeyin yeni binası Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə inşa edilib, bu işdə Heydər Əliyev Fondunun və UNESKO-nun dəstəyi və köməkliyi olub. Xalça Muzeyinin yeni binasının açılış mərasimi bu il avqust ayının 26-da keçirilib. Açılış mərasimində Azərbaycan Prezidenti İlham Əliyev və xanımı Mehriban Əliyeva da iştirak ediblər. Ölkə Prezidenti İlham Əliyev və xanımı Mehriban Əliyeva muzeyin yeni binasının rəmzi açılışını bildirən lenti kəsiblər. Dövlət başçımız çıxışında bildirib ki, Bakı sakinləri, qonaqlar üçün muzeyüzrə reprezentativ siyahısına daxil edilib. Biz öz xalçamızı, xalçaçılıq sənətimizi qoruyuruq. Azərbaycan xalçasının qorunması və inkişaf etdirilməsi haqqında müvafiq qanun da qəbul edilib. Bu, bizim böyük sərvətimizdir və əlbəttə çalışmalıyıq ki, gənc nəsil bu sənətə maraq göstərsin. Biz bunu təşviq etməliyik".

Biz muzeydə olarkən onun əsas funksiyaları haqqında maraqlı məlumatlar öyrəndik. Daimi ekspozisiya və müxtəlif sərgilərinin təşkili, elmi-tədqiqat işlərin aparılması, interaktiv proqramların işlənib hazırlanması, xalça sənətinin qorunması, beynəlxalq əlaqələrin inkişaf etdirilməsi, tərəfdaşlıq layihələrin hazırlanması və icrası və s. muzeyin əsas funksiyalkarıdır. Hazırda muzeyin fondunda 15.000-ə qədər eksponat mövcuddur. Onlar aşağıdakı kolleksiyalar üzrə bölünür: xalça və xalça məmulatları ,metal parça, geyim və tikmə,saxsı, şüşə, ağac və kağız, zərgərlik. Muzeyin eksponatları bizdə xoş təəssürat yaratdı.

**Könül Əhmədova,**
**Pedaqoji fakültənin**
**II kursunun 201-ci qrup tələbəsi**



# Tələbələrimiz 1 nömrəli Uşaq Somatik Sanatoriyasında olublar

Noyabr ayının 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) - Tələbə Gənclər Təşkilatının (TGT) üzvləri Pedaqoji fakültənin təşkilatçılığı ilə həyata keçirilən "Hər uşağa bir təbəssüm" layihəsi çərçivəsində həmin fakültənin tələbələri ilə birlikdə Sabunçu rayonunun Maştağa qəsəbəsində yerləşən 1 nömrəli Uşaq Somatik Sanatoriyasını ziyarət etmişlər.

Bildiyimiz kimi, cəmiyyətin sağlam olması üçün onun təməlinin möhkəm və sarsılmaz olması əsas şərtdir. Uğurlu cəmiyyət, təməli-körpələri, uşaqları, yeniyetmələri yüksək səviyyədə yaradıcı, inkişaf etmiş və faydalı vətəndaş olan bir ictimai mühitdir. Uşaqlarımızı, yeniyetmələrimizi belə yetişdirə bilmək öhdəliyi ilk öncə məhz onların valideynlərinin üzərinə düşür. Lakin Dövlət Statistika Komitəsindən aldığımız məlumatlara görə, Azərbaycanda uşaqların, yeniyetmələrin 77% -i valideyn himayəsindən məhrum olmuş və müxtəlif uşaq evlərində yerləşdirilmişdir. Bununla da cəmiyyətimizin təməli olan uşaqlarımızın psixologiyasına ağır zərbə vurulur. Amerikalı psixoloqların verdiyi məlumata görə,məhz uşaq evlərində böyüyən körpələr böyüdükdən sonra cəmiyyətə adaptasiya oluna bilmir və beləliklə, qarşısıalınmaz problemlərin yaranmasına səbəb olurlar.

Cəmiyyətimizdə mühüm yer tutan, valideyn himayəsindən məhrum olmuş uşaqlarımızın, yeniyetmələrimizin ağır psixoloji durumları onların gələcək həyatına kölgə salaraq birbaşa cəmiyyətimizin sabahına da təsir etmiş olur. Bu vəziyyətin qarşısını almaq ,onları həyata qazandıraraq, eyni zamanda onların öz həyatlarını da qazanmalarına vasitəçi olmaq zərurəti bu layihənin yaranmasına səbəb oldu.

ADPU-nun Pedaqoji fakültəsinin IV kursunun 402-ci qrup tələbəsi, TGT-nin fakültə sədri və "Hər uşağa bir təbəssüm" layihəsinin rəhbəri Günel Əkbərin verdiyi məlumata görə, layihənin əsas məqsədi ailə qayğısından məhrum olmuş uşaqları qayğı və sevgi ilə əhatələmək, onların cəmiyyətə adaptasiyasını təmin etmək, valideyn himayəsindən məhrum olmuş uşaq və yeniyetmələrimizə psixoloji dəstək göstərərək, onların gələcək həyatını sığortalamaq, eyni zamanda onları sözün əsl mənasında cəmiyyətə qazandırmaqdan ibarətdir. Axı bu günün körpəsi sabahın gəncidir. Gələcəyimizi uğurlu görmək istəyiriksə, ilk növbədə, cəmiyyətin təməli olan körpələri, uşaqları himayə etməliyik. Valideyni tərəfindən müəyyən səbəblərə görə tərk edilmiş uşaqların qayğısına qalmaq isə bizim üzərimizə düşür.

Bu layihəni həyata keçirərək bir çox vəzifələri üzərimizə götürmüşük. Bunlar aşağıdakılardır:

1. Valideyn himayəsindən məhrum olmuş uşaqları psixoloji-sosial gərginlikdən çıxarmaq;
2. Onların gələcək həyatlarını qurmaq üçün mayak rolunu oynamaq və onları cəmiyyətə adaptasiya etmək;
3. Bu uşaqların ictimaiyyətlə əlaqələrini təmin etmək və yeniyetmələrimizin sosial həyatlarını zənginləşdirmək;
4. Həyatda öz yerlərini tapmağa yardımçı olmaq və potensiallarını üzə çıxarıb inkişaf etdirməkdə yardımçı olmaq;
5. "Valideynsizlik" simptomundan xilas etmək və fikirlərini keçmişdən ayırıb gələcəyə istiqamətləndirmək;
6. Cəmiyyətdə onlara qarşı yönələn fikirləri müsbət istiqamətə doğru yönəltmək və onları sosial statusla təmin etmək;
7. Təbəssüm dairəsini genişləndirmək.

Sadaladığım bu vəzifələrin yerinə yetirilməsi ilə, eyni zamanda bu işə tələbələrimizin cəlb edilməsi ilə cəmiyyətimizin böyük kütləsini səfərbər etmiş oluruq. Bu işdən böyük qürur hissi keçiririk. Onu da qeyd edim ki, bu yolda atılan ilk addımımız 75 nəfər körpənin sevincinə səbəb oldu. Ümid edirik ki, növbəti addımlarımızda bu işin faydası daha da artacaq.

**"Gənc müəllim"**

# Təbrik edirik!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) universitetimizin, eləcə də ölkəmizin ictimai-mədəni həyatında fəal iştirak etməsi hamımıza yaxşı məlumdur. TGT Gənclər və İdman Nazirliyinin, Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun, Səbail Rayon Gənclər və İdman İdarəsinin və Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) gənclərin mənəvi inkişafına kömək edən




müxtəlif tədbirlərində, çoxsaylı layihələrində fəal iştirak edərək ölkəmizdə uğurla həyata keçirilən dövlət gənclər siyasətinə öz layiqli töhfələrini verir. Əminliklə deyə bilərik ki, TGT bütövlükdə həm ölkəmizdə, həm də bir çox xarici ölkələrdə keçirilən müxtəlif ictimai-mədəni tədbirlərin fəal iştirakçısıdır. Elə buna görə də ADPU TGT göstərdiyi xüsusi fəallığa görə ATGTİ-nin müvafiq qərarı ilə ali və orta ixtisas təhsili müəssisələri arasında "Oktyabr ayının TGT-si" seçilib. Biz də qazandıqları bu uğur münasibətilə TGT-nin sədri, fəal ictimaiyyətçi Sahil Qələndərovu və təşkilatın bütün üzvlərini təbrik edir, onlara gələcək fəaliyyətlərində yeni-yeni uğurlar arzulayırıq.

**Mətbuat və informasiya şöbəsi**

# 9 Noyabr - Dövlət Bayrağı Gününə həsr olunmuş intellektual yarış

Noyabr ayının 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı və Səbail Rayon Gənclər və İdman İdarəsinin təşkilati dəstəyi ilə ADPU-da 9 Noyabr - Dövlət Bayrağı Gününə həsr olunmuş "Nə? Harada? Nə zaman?" intellektual oyunu üzrə "I Universitet Kuboku"nun turniri keçirilib. Məlumat üçün qeyd edək ki, bu intellektual oyunda öncədən iştirak etmək hüququ qazanmış 18 komanda iştirak edib. Komandalara 36 sual verilib. Suallara daha çox və düzgün cavab verən Kimya fakültəsinin "Evrika" komandası turnirin qalibi olub. Tarix fakültəsinin "Qafqaz"komandası 2-ci yerin, Filologiya fakültəsinin "Heksoqon" komandası isə 3-cü yerin sahibi olub.

Qalib komandalar diplom, medal və kubokla mükafatlandırılıblar.

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin II kurs tələbəsi,**
**TGT-nin fakültə sədri**

# Tələbə Gənclər Təşkilatı "Tələbə kuboku" adlı velosiped yarışı keçirib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) və Azərbaycan Velosiped İdmanı Federasiyasının "Azərbaycan gəncliyi 2011-2015-ci illərdə Dövlət Proqramı"nın müvafiq bəndinin icrasına uyğun olaraq velosiped idmanının daha da populyarlaşması və kütləviliyinin təmin edilməsi, eləcə də gənclərin asudə vaxtlarının səmərəli təşkili və sağlam həyat tərzinin təbliğ olunması məqsədilə həyata keçirdikləri birgə layihə noyabr ayının 29-da yekunlaşdı. Həmin gün Veloparkda ADPU-nun fakültələrinin komandaları arasında "Tələbə kuboku" yarışı keçirilib.



Məlumat üçün qeyd edək ki, komandaların tərkibi 4 nəfərdən-2 nəfər oğlan və 2 nəfər qızdan ibarət olub. Estafet yarışında mübarizə aparan iştirakçılar velosiped və digər zəruri avadanlıqlarla təmin ediliblər. 16 komandanın iştirak etdiyi yarışın ilk mərhələsində ən yaxşı nəticə göstərən 4 komanda müəyyənləşib və onlar final yürüşündə çempionluq uğrunda mübarizə aparıblar. Yekunda Kimya fakültəsinin komandası finiş xəttini birinci keçərək "Tələbə kuboku"nun qalibi olub. 2-ci yeri Tarix fakültəsinin komandası, 3-cü yeri isə Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin komandası tutub.

İlk 3 yeri tutan komandalar Azərbaycan Velosiped İdmanı Federasiyası tərəfindən müvafiq olaraq 200, 150 və 100 manat pul mükafatı, kubok, medal və diplomla təltif ediliblər. Qeyd edək ki, ADPU-nun tələbə-gəncləri arasında keçirilən bu yarış pilot layihə idi və yaxın vaxtlarda digər ali təhsil müəssisələri arasında ümumrespublika "Tələbə kuboku"nun təşkili də nəzərdə tutulur.

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin**
**II kurs tələbəsi, TGT-nin fakültə sədri**

# Kitabxanamız zənginləşir

1. "Qarabağ: folklor da bir tarixdir". I kitab (Ağdam, Füzuli, Ağcabədi, Cəbrayıl, Zəngilan,Qubadlı,Laçın və Kəlbəcər rayonlarından toplanmış folklor örnəkləri). Bakı, "Elm və Təhsil", 2012, 464s.

II kitab. ( Bərdə və Ağcabədi rayonlarından toplanmış folkor örnəkləri).Bakı, "Elm və Təhsil", 2012, 483s.

III kitab. (Ağdam, Füzuli, Cəbrayıl, Tərtər,Qubadlı,Zəngilan,Kəlbəcər,Laçın və Şuşa rayonlarından toplanmış folklor örnəkləri). Bakı, "Elm və Təhsil", 2012,468s.

V kitab.(Bərdə, Füzuli,Ağdam,Şuşa və Zəngilandan toplanmış folklor örnəkləri). Bakı, "Zərdabi LTD"MMC, 2013, 451s.

VI kitab. (Cəbrayıl,Kəlbəcər və Tərtər rayonlarından toplanmış folklor örnəkləri). Bakı, "Zərdabi LTD" MMC, 2013, 465s.

2. "Şimal-Qərbi Azərbaycan tarixi". Bakı, "Şərq-Qərb" Nəşriyyat evi, 2011, 424s.

Monoqrafiyada Azərbaycanın Şimal-Qərb regionu tarixinin qədim dövrdən başlayaraq XX əsrin 30-cu illərinədək bir sıra konseptual məsələləri işıqlandırılmışdır. Müəlliflər tərəfindən zəngin arxiv sənədləri və ədəbiyyat vasitəsi ilə bu torpaqların Azərbaycanın qədim, orta əsrlər və yeni tarix dövrü boyunca ayrılmaz hissəsi olması faktı sübut olunur.

3. Yunus Oğuz. "Qədim türklər və passionarlıq nəzəriyyəsi L.N. Qumilyovun tədqiqatlarında". Bakı, "Şərq-Qərb" Nəşriyyat evi, 2011, 192s.

4. Seyidov Ə.C.,Nağiyev Z.S. "Hüququn əsasları". Metodik vəsait. Bakı, "Uni Print", 2012, 318s.

Metodik vəsait ali məktəb tələbələri üçün nəzərdə tutulmuşdur.

5. "Türk xalqları folkloru". I kitab. Krım-tatar xalq şeirindən seçmələr. Bakı, "Nurlan", 2013, 180s.

6. Əlimirzəyev A.N. "Erkən Elam cəmiyyəti: siyasi-iqtisadi münasibətlər və yazı tarixi (e.ə.IV-III minilliklər)". Bakı, "Şərq-Qərb "Nəşriyyat evi, 2011, 264s.

A.N. Əlimirzəyevin bu kitabı sinifli cəmiyyətin ilk yaradıcılarından olan elamlıların e.ə. III minillikdə siyasi-iqtisadi tarixinə həsr olunmuş ilk anadilli monoqrafiyadır. Əsər şumer,akkad və elam dillərində tərtib olunmuş mixiyazılı mənbələr əsasında qələmə alınıb.

7. Mahmudov Y. "Səyyahlar, kəşflər, Azərbaycan". Bakı, "Təhsil", 2012, 296s.

Görkəmli tarixçi, AMEA-nın müxbir üzvü Yaqub Mahmudlunun "Azərbaycan tarixi səyyah gündəliklərində" seriyasından olan "Səyyahlar, kəşflər,Azərbaycan" adlı kitabı ən qədim zamanlardan Böyük Coğrafi kəşflərin sonlarınadək Dünya okeanının öyrənilməsində böyük rol oynamış məşhur səyyahların həyatına və kəşflərinə həsr olunmuşdur.

8. Ağasiyev İ. "XVIII əsrin sonu-XX əsrin əvvəllərində almanların Qafqazda məskunlaşması". Bakı, "Təhsil", 2009, 304s.

Müəllif geniş arxiv materialları və digər yazılı mənbələr əsasında XVIII əsrin sonundan XX əsrin əvvəllərinə qədərki dövrdə Şimali və Cənubi Qafqazda mövcud olmuş 250-yə yaxın alman koloniyasının fəaliyyət xüsusiyyətlərini göstərmiş, regionun inkişafında onların roluna obyektiv qiymət vermişdir.

9. Bayramova N. "Şamaxı xanlığı". Bakı, "Təhsil", 2009, 396s.

Kitab XVIII yüzilliyin ikinci yarısı-XIX yüzilliyin əvvəllərində Azərbaycanda mövcud olmuş xanlıqlardan birinin-Şamaxı xanlığının tarixinə həsr olunmuşdur.

10. Məmmədov N. "Azərbaycan SSR Dağlıq Qarabağ bölgəsinin şəhər və rayonlarının tarixi. (XX əsrin 20-90-cı illəri)". Bakı, "Təhsil", 2010, 200s.

Kitabda Azərbaycan SSR-in Dağlıq Qarabağ bölgəsinin şəhər və rayonlarının tarixi kompleks şəkildə tədqiq edilir.

11. Məmmədov R. "Ali riyaziyyat". Ali məktəblər üçün dərslik. I hissə.Bakı, "Turan Evi" nəşriyyatı, 2013, 570s.

12. Gözəlova Y. "Orta əsrlərdə Avrasiyanın ticarət əlaqələri". Bakı, "Təhsil", 2011, 296s.+xəritələr.

Monoqrafiyada V-XV əsrləri əhatə edən 1100 illik xronoloji çərçivədə Avrasiyanın ticarət əlaqələri kompleks şəkildə araşdırılır.

13. "Azərbaycan və Müstəqil Dövlətlər Birliyi ölkələri" Statistik məcmuə. Bakı, 2013, 227s.

14. "Statistik nəşrlərin kataloqu". Bakı,2014,46s.

15. "Fəridə Hacıyeva. Biblioqrafiya: 60 illik yubileyi münasibətilə". Bakı, "Nərgiz" nəşriyyatı,2013,116s.+20s.rəngli,şəkil.

16. Murquzov M., Ələkbərov A., Həsənov O. "Ümumi fizika kursu". Bakı, "Elm və Təhsil", 2011, 256s.

Dərs vəsaitində ümumi fizikanın müasir təsnifat üzrə aparılmış bölmələri-mexanika,molekulyar fizika və termodinamika, elektrik və maqnetizm, optika, atom, nüvə və elementar zərrəciklər fizikasının əsasları öz əksini tapmışdır.

17. Məmmədli Ş. "XVII- XVIII əsrlərdə Azərbaycan-Hindistan ticarət əlaqələri". Bakı, "Şərq-Qərb " Nəşriyyat Evi, 2011, 152s.

Monoqrafiyada Azərbaycan şəhərlərində istehsal olunan məhsulların son orta əsrlərdə böyük miqyasda ticarət aparan hindli tacirlər tərəfindən nəinki Hindistana, həmçinin bir çox Avropa ölkələrinə ixracından bəhs edilir.

18. Mahmudov Y. "Özümüz ". Bakı, "Aspoliqraf", 2008, 172s.

Kitabda ötən əsrin 60-70-ci illərinin əvvəllərində Rəsul Rza başda olmaqla, ilk Azərbaycan Ensiklopediyasını hazırlayan şəxslərin xalqımızın ulu keçmişinin, yaratdığı milli və ümumbəşəri dəyərlərin ensiklopediyada doğru-düzgün əks olunması uğrunda rəsmi ideologiyanın müdafiəçilərinə, onların Mərkəzdəki havadarlarına və erməni saxtakarlarına qarşı çətin mübarizəsindən bəhs olunur.

19. Mahmudov Y., "Azərbaycanın Avropa ölkələri ilə əlaqələri. Ağqoyunlu dövrü.(XV əsrin II yarısı)". Dərs vəsaiti. Bakı, "Təhsil", 2007,116s.

XV əsrin II yarısında Azərbaycanın Avropa ölkələri ilə əlaqələrinə həsr edilmiş bu kitabda Ağqoyunluların hakimiyyəti dövründə Azərbaycanın Avropa ölkələri ilə qarşılıqlı əlaqələrini doğuran tarixi şərait, Qərb ölkələri ilə diplomatik əlaqələrimiz, Avropanın Şərq siyasətinin mahiyyəti araşdırılır.

20. Mahmudov Y. "Azərbaycanlılar" (etniksiyasi tarixə ümumi baxış). Bakı, "Aspoliqraf", 2008, 64s.

Kitabda dünya tarixində dərin iz qoymuş və zəngin mədəniyyət yaratmış Azərbaycan xalqının etnik-siyasi tarixinə qısa nəzər salınır.

21. Mahmudov Y.M. "Orta əsrlər tarixi. Avropa erkən orta əsrlərdə". Dərslik. Bakı, "Təhsil", 2012,216 s.

Dərslikdə orta əsrlərin ilk çağlarında Avropa ölkələrində feodal münasibətlərinin meydana gəlməsi və təşəkkülü, Fransa, İtaliya, Almaniya, İngiltərə, həmçinin Bizans tarixinin ən mühüm hadisələri öz əksini tapmışdır.

22. "Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın icrasının yekunları. Uğurlu siyasətin nəticələri. Bakı,2014,228s.

23. "Azərbaycan Milli Ensiklopediyası". I cild. A-Argelander. Bakı, "Azərbaycan Milli Ensiklopediyası", Elmi Mərkəzi 2009, 608 s.

Azərbaycan Milli Ensiklopediyasının cildlərində dünya sivilizasiyasının mühüm mərhələlərini, ayrı-ayrı ölkələrin və xalqların tarixini,incəsənətini, elecə də iqtisadiyyatını, elmini səciyyələndirən ətraflı məlumatlar, müxtəlif elm sahələrinə və texnikaya dair terminlərin izahı verilir.

II cild. Argentina-Babilik. Bakı, "Azərbaycan Milli Ensiklopediyası" Elmi Mərkəzi, 2010, 604s.

III cild. Babilistan-Bəzirxana. Bakı, "Azərbaycan Milli Ensiklopediyası" Elmi Mərkəzi,2011,604s.

24. "Azərbaycan Milli Ensiklopediyası". 25 cilddə. Azərbaycan cildi.

Rus dilində. Bakı, "Azərbaycan Milli Ensiklopediyası" Elmi Mərkəzi. 2012, 990s.

25. "Mexanika və molekulyar fizika" (Laboratoriya praktikumu). Professor E.Ə.Eyvazovun redaktorluğu ilə. Bakı,ADPU-nun mətbəəsi, 2014, 230s.

Kitabda pedaqoji universitetlərin xüsusiyyətlərini nəzərə almaqla, ümumi fizikanın mexanika və molekulyar fizika bölmələrinin əsas qanunauyğunluqlarını təcrübi olaraq yoxlamağa imkan verən təcrübi metodlar şərh edilir.

26. İsgəndərov M. "Analitik kimya. Niyə? Nə üçün? " Yenidən işlənmiş ikinci nəşri. Bakı, ADPU-nun mətbəəsi, 2011, 409s.

Dərs vəsaitində ali məktəblər üçün zəngin pedaqoji irs qoyub getmiş professor A.A.Verdizadənin "Vəsfi yarımmikrokimyəvi analiz", "Vəsfi kimyəvi analizin nəzəri əsasları", akademik H.B.Şahtaxtinskinin "Miqdari kimyəvi analiz" adlı dəyərli dərsliklərindəki kollokviumlar üçün nəzərdə tutulmuş məzmunca elmi,pedaqoji və metodik cəhətdən düzgün seçilmiş sual və çalışmaların cavabları verilmişdir.

27. Babayev Y. "Təriqət ədəbiyyatı: sufizm,hürufizm". Ali məktəblərin filoloji fakültələri üçün dərs vəsaiti. Bakı, "Elm və təhsil", 2011, 160s.

Kitabda orta əsrlər İslam şərqində geniş yayılmış sufizm və hürufizm kimi təriqət cərəyanlarının təşəkkülü, tarixi, mahiyyəti və bədii ədəbiyyata, xüsusilə də Azərbaycan ədəbiyyatına təsiri məsələləri yığcam və mümkün qədər sadə elmi dildə ifadə olunur.

28. Quluzadə Ə. "Ürəyindən keçəydim".(Şeirlər). Bakı, "Ozan", 2010, 248s.

Ə.Quluzadənin "Ürəyindən keçəydim"şeirlər toplusunda Azərbaycan qadınlarının sədaqətindən, ləyaqətindən, ismətindən bəhs edən poetik nümunələr yer almışdır.

29. İsakov H.V. "Azərbaycan Respublikasının "Böyük İpək yolu"nun bərpasında iştirakı (1991-2005-ci illər)". Bakı, "Şərq-Qərb"Nəşriyyat evi, 2011, 284s.

Azərbaycan tarixşünaslığında ilk dəfə olaraq "İpək yolu"nun bərpası prosesi monoqrafiyada kompleks şəkildə tədqiq edilmişdir.

30. Əhməd Zəki Vəlidi "Azərbaycanın tarixi coğrafiyası". Bakı, "Təhsil", 2009, 112s.

Ə.Z.Vəlidinin "Azərbaycanın tarixi coğrafiyası"na həsr olunmuş əsəri (məruzələri) bu sahədə atılmış mühüm addım olması və elmi əhəmiyyətinə görə diqqəti cəlb edir.

31. Qaşqay S.M. "Ön Asiyada miqrasiya proseslərinə dair". "Bakı, Şərq-Qərb", 2009, 120səh.

Əsərdə Yaxın Şərqdə qədim xalqların dilinə və tarixinə təsir edən miqrasiya prosesləri haqqında məlumat verilir.

32. "Təcrübəçi tələbələrə kömək".(pedaqoji təcrübə üçün metodiki vəsait).(təkrar nəşr). Bakı, ADPU-nun nəşriyyatı, 2014, 79səh.

33. "Ali təhsilin bakalavriat pilləsində müəllim hazırlığı üzrə. "Pedaqogika" fənninin kurikulumu". Bakı, "Elm və təhsil".2014,96s.

34. Əhmədov Ş.Ə.,Məmmədova Ş.İ. "Ekoloji monitorinq". Ali məktəblər üçün dərs vəsaiti. Bakı, "AzTU-nun mətbəəsi", 2012, 120s.

Dərs vəsaitində atmosfer havasının, su ehtiyatlarının, torpağın, biotik komponentlərin müşahidə edilməsi, qiymətləndirilməsi və vəziyyətlərinə nəzarətin metodik əsasları şərh edilmişdir.

35. "Sağlamlığın qorunması və həyat fəaliyyətinin təhlükəsizliyi". Professor T.Ə.Feyzullayevanın ümumi redaktorluğu ilə. Bakı,ADPU, 2014, 118s.

36. Məmmədov V.R., Əsədov N.N. "Azərbaycan tarixi fənnindən kurs və sərbəst işlərin hazırlanmasına dair metodik göstəriş". Bakı, ADPU, 2014, 63s.

37. Türkman İ.M. "Tarix-i aləmara-yı Abbası (Abbasin dünyanı bəzəyən tarixi). I cild. Bakı, "Təhsil", 2009,792s.

Bu kitab Səfəvi dövrünün ən məşhur müəlliflərindən biri olmuş və I Şah Abbasın sarayında xidmət etmiş görkəmli Azərbaycan tarixçisi İsgəndər bəy Münşi Türkmanın (1560/61-1634) farsca yazdığı "Tarix-i aləmara-yı Abbasi" (Abbasin dünyanı bəzəyən tarixi) adlı üççildlik əsərin birinci cildininAzərbaycan dilinə tam tərcüməsidir.

38. Həsənov H. N. "XIX əsrin sonu-XX əsrin əvvəllərində Şimali Azərbaycan kəndinin tarixindən". Bakı, "Təhsil", 2007, 224s. (kitab rus dilindədir)

39. Niftəliyev İ.V. "Azərbaycan SSR ermənilərin ekspansionist planlarında (XX əsrin 20-ci illəri)" Rus dilində. Bakı, "Təhsil", 2009, 254s.

40. Əlizadə Z. "Azərbaycan SSR-də ali tarix təhsilinin inkişafı və tarixi kadrların hazırlanması(1920-1941-ci illər)". Bakı, "Şərq-Qərb", 2011, 104s. Rus dilində.

41. Hajıyeva U D. "English stylistics". (methodical aid). Baku, ADPU, 2014, 166s. (kitab ingilis dilindədir).

## Rus dilində

1. Qurbanova S.A. «Qeydar Aliev i vneşne-politiçeskiy kurs Azerbaydjanskoy Respubliki». Baku, «Şərq-Qərb», 2010, 72str.

2. Alibekova G.B. «Voprosı drevney istorii Azerbaydjana v rossiyskoy istorioqrafii XIX-naçala XX vv». Baku, «Təhsil», 2009, 224 str.

3. Aliev F.A., Niftiev A.A.,Zeynalov Dj.İ. «Metodı reşenię zadaç neçetkoqo optimalğnoqo upravlenię». Baku, «Glm», 2013, 204str.

4. Qasanov Q. «Na puti k pervoy respubliki».(Oçerki istorii Azerbaydjana s fevralə 1917 qoda do may 1918 qoda). Baku, «Şərq-Qərb»,2010,480str.

5. Melikov R.S. «Drevnepersidskie nadpişi». Transliteraüiə, perevod, qlossariy. Baku, İzdatelğskiy Dom «Şərq-Qərb», 2013, 448str.

6. Alekperov A. «Törki Azerbaydjana» (drevnostğ i ranee srednevekovğe). Baku, İzdatelğskiy Dom «Şərq-Qərb», 2011,560str.

7. Seidbeyli M.Q. «Azerbaydjanskaə diaspora v Rossii: osobennosti i tendenüii formirovanię i razvitię ( 1988-2010 q q). Baku, İzdatelğskiy dom «Şərq-Qərb», 2011, 576str.

8. Şarifov M.Ş. «Teoretiko-pravovıe problemı obespeçenię suvereniteta: deüizionistiçeski-neorealistskiy analiz». M.,İzdatelğstvo «Pravo», 2012, 270 str.

9. Şarifova S.Ş. «Janrovoe smeşenie v romane: kommunikativno-soüiokoqnitivnıy podxod». Moskva, «Moskovskiy Parnas», 2011, 400 str.

**Fəridə Məmmədova,**
**Elmi kitabxananın Məlumat-biblioqrafiya şöbəsinin böyük biblioqrafi**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fiziki coğrafiya kafedrasının müdiri Məhəmməd Abdiyevə atası

**Abdı Abdiyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elektrik və optika kafedrasının Nadir torpaq-metal materialları fizikası elmi-tədqiqat laboratoriyasının müdiri, dosent

**Şubay Sərdarovun**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Kompüter Mərkəzinin "Elm və tədrisin informalaşdırılması şöbəsi"nin riyaziyyatçı-proqramçısı

**Etibar Axundovun**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının müəllimi Jalə Qafarovaya bacısı

**Kəmalə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elmi hissənin əməkdaşı Günay Yusifovaya babası

**Əziz müəllimin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının əməkdaşı Kifayət Alıyevaya qardaşı

**Sahib Alıyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Magistratura və doktorantura şöbəsinin əməkdaşı Ülviyyə Həsənova nənəsi

**Həmayıl Məmmədovanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 4490
Sayı: 1500
Çapa imzalanıb: 29.11.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.